**TARİX HISTORY ИСТОРИЯ**

DOI: 10.36719/AEM/2007-2020/50/4-8

**Əli Umud oğlu Əliyev**
ADPU-nun Ağcabədi filialı

# 26 FEVRAL XOCALI SOYQIRIMI GÜNÜDÜR. SAĞALMAZ XOCALI YARASI MƏQSƏDLİ HƏYATA KEÇİRİLƏN SOYQIRIMDIR

***Açar sözlər:*** *Xocalı yarası, məqsədli soyqırım, Ərmən Alban tayfası, "bolorqir" ermənilərə, "notrqir" albanlara məxsusdur*
***Keywords****: Rana Khojaly, genocide, Albanian tribes Arman*
***Ключевые слова****: Ходжалы, геноцид, албанские племена арман*

Zaman bütün yaraları sağaldır, amma Xocalı yarası sağalmır ki, sağalmır. Ona görə Xocalı yarası cağalmır ki, bu yara cismani yara deyildir. Bu yara ideoloji yaradır, bu coyqırımdır. Vəhşilikdir, bəşəriyyətin dərk edə bilmədiyi, vəhşi heyvanların edə bilmədikləri vəhşilikdir. Zaman və məkan daxilində belə bir hadisə baş verməmişdir ki, vəhşi heyvanlar planlı şəkildə sürü halında biri-birilərinin üzərinə hücuma keçsinlər və biri digərini bütünlüklə məhv etsinlər. Lakin dünyanın əşrəfi adlandırdığımız insanlar tarix boyunca ta qədim dövrdən bu günə kimi biri-birilərini məhv edib, daimi olaraq bu məhvetməni davam etdirməkdədirlər. Belə məhvetmə siyasəti yürüdənlərdən biri erməni qaniçənləri və onların havadarlarıdır. Ona görə də erməniyə insan demək dünyanın əşrəfi saydığımız insanları ləkələmək deməkdir.

Yaxşı ki, ölüm vardır. Ölüm olmasaydı, dünya kin və küdurətlə dolub, qan gölündə çalxalanardı. Yaxşı ki, yaxşılar var deməklə yanaşı, yaxşı ki, ölüm də var deməliyik. Mən zorakılıqla öldürməyi nəzərdə tutmuram, əcəli ilə ölənin ölümünü nəzərdə tuturam və bu ölümü bəşəri ölüm adlandırıram. Xocalıda ölənlər bəşəri ölümdən kənar, insanlığa sığışmayan, təsəvvürə gətirilməsi mümkün olmayan dəhşətli faciə, insanların ucdantutma-uşaqdan böyüyə qırılması ilə zamanın yaddaşında əbədi həkk olunmuş soyqırımdır. Xocalıda 613 nəfər amansızlıqla qətlə yetirilmiş, 150 nəfər itkin düşmüş, 1275 nəfər əsir götürülmüşdür. Bu kütləvi soyqırımı ermənilər rus əsgər və zabitlərinin iştirakı ilə xiristian həmrəyliyi ideologiyası altında yerinə yetirdilər. Onların vəhşilikləri (güllələmək, ölünün bütün əzalarını doğramaqla həzz almaq, uşaqları əzabla qətlə yetirib həzz almaq-bunu Ermənistanın prezidenti Serj Sarkisyan dünya tribunasından bəyan etməklə fəxr etdi ki, mən Qarabağda belə cəlladlıq etmişəm, hamilə qadınların qarnını cırıb təzə formalaşan körpəni süngüyə keçirib fəxrlə hədyan-hərcayi söyüşlərlə həzz almaq, qoca, qadın, uşaq, gəlin və qızları zorlayıb rüsvay etməklə həzz alan və s.) insanlığa ləkədir, nə qədər ki, Azəbaycan türk milləti var, bu sağalmaz yara da unudulmayacaq.

Rusların qaniçən, vəhşi xislətli olmasını, bir sıra xalqları məhv etməyə çalışmalarını XII əsrdə yaşamış Azərbaycanın dünya şöhrətli filosof şairi Nizami Gəncəvi reallıqla qələmə almış, onların xarakterik xüsusiyyətlərini belə təsvir etmişdir:

Çox keçməz ki, ruslar keçər hər yana,
Rumu, həm Ərməni qoyar virana.
Elə ki, keçirər ələ xəzinə,
Durmayıb tələsik qaçarlar yenə.
Şəhərlər alaraq, talar hər yanı,
Bəlkə də tutarlar bütün dünyanı.
Onlarda aslanla qurd ürəyi var,
Qana mərd, süfrəyə aciz olurlar.
Ruslardan adamlıq gözlənməz bir an,
Yalnız surətindən görünər insan.

Eşşəyin cəvahir olsa da yükü
Yenə də eşşəkdir, parıldar tükü.
Madam ki, yol tapmış bunlar xəzinəyə,
Ziyanlıq verəcək bir çox ölkəyə.
Zülümlə açacaq yeni qol-qanad,
Karvanlar soyacaq, sönəcək həyat.
Ölkəyə dərindən ziyan vuracaq,
Ruma, Xorasana əl uzadacaq. (1, 311.)

XII əsrdə qələmə alınmış bu fikirlər, Nizami Gəncəvinin peyğəmbər kimi uzaqgörənliyi, XIX yüzilliyin başlanğıcından açıq-aydın özünü göstərdi.

XIX əsrin əvvəllərində Rusiya Azərbaycanı işğal etdikdən sonra öz hökmranlığını möhkəmlətmək və işğal etdiyi ərazilərdə manqurtlaşdırma siyasəti yeritmək, münaqişə ocaqları yaratmaq kimi "perspektiv" planlar qarşıya qoymuş və bu planları uğurla yerinə yetirmişdir. Belə bir "parçala hökm et" siyasətini erməni siyasəti adlandırıram. Ümumiyyətlə, Azərbaycan türk millətinə, dövlətçiliyinə, ərazi bütövlüyünə qarşı çevrilmiş hər bir ideya və idealogiyanı erməni siyasəti kimi dərk edirəm. Bu erməni siyasətinin məqsədi hansı yolla olursa olsun Azərbaycan türk millətini yox etmək, Azərbaycan torpaqlarını özününküləşdirmək üçün müxtəlif üsullara, variantlara əl atmaqla Azərbaycanı xəritədən silməkdir.

Rus şovinizmilə erməni məkri 200 ildir ki, Azərbaycan türk millətini məhv etmək siyasəti ilə bir çox işlər görmüş, dədə-baba torpaqlarımızda özlərinə vətən yaratmış, əcdadlarımız olan Albanların ər tayfasının adı altında gizlənən haylar Alban torpaqlarına sahib çıxmışlar.

Məlumdur ki, erməni Alban tayfasıdır. Bütün Türk tayfaları ilə və eləcə də Albanlarla düşmən mövqedə olan haylar Ərmən tayfasının xristian olmasından istifadə edərək həmin tayfanın adı altında gizlənmişlər. Ona görə belə etmişlər ki, Alban torpaqlarına sahib dursunlar, vətənsiz bir tayfa özlərinə vətən tapsınlar. Bu ideya onların daimi olaraq xain xislətini tənzimləyən atribut kimi səciyələnir. Ərmən Alban tayfası İrəvan xanlığının yerində yerləşirmiş. Gəlmə tayfa olan haylar Ərmən tayfasını assimliyasiya etmişdir. Ərmən Alban tayfası ilə düşmən mövqedə olan haylar daimi olaraq Alban tayfalarını təqib etmiş, işgəncələr vermiş, qırğınlar törətmiş, tarixin yaddaşında silinməz izlər qoymuşlar. O qədər haylar Türk tayfalarını qovmuşlar ki, bu gün də tələsik bir iş gördükdə__"nə olub, hay gəlir?" – deyirlər. Yəni ən qəddar düşmən və quduz tayfa haylar daimi olaraq Türklərin qənimi olmuşlar.

Ərmən sözünün mənası mən igidəm deməkdir ki bu da Azərbaycan dilinə məxsusdur. Filolofiya elmləri doktoru, professor Sadıq Şükürov da belə bir doğru nəticəyə gəlmişdir ki, "ərmən" sözü xalis türk sözüdür. Hay tayfaları Ərmən adını özləri üçün millət adı seçmişlər. Onlar Ərmən adını "erməni" formasında qəbul etmişlər. Xalq arasında belə bir fikir dolaşır ki, daim yer iddiasında olduqları üçün "er"-yer, "məni"-mənim deməkdir. Ona görə də İrəvan sözünü "Yerevan" etməklə yenə də yer sözündən əl çəkməmişlər.

"... erməni kilsəsi Albaniyada ölkəni erməniləşdirmək aləti olmuşdur. Erməni kilsəsi "Albaniyanın bütün kilsələrində sülh"ü yalnız yadelli işğalçıların köməyi ilə bərqərar edirdi, erməni katolikosluğunun mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçılarının köməyinə əl atır, "xaç bayrağı ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi olan Qarabağ (Arsax) xalqlarını" yox edirdi" (5,11)

Bu yoxetmə bu gün sözün həqiqi mənasında tam başa çatmışdır. Azərbaycanın dədə-baba torpağı olan İrəvan xanlığında və Qarabağ bölgəsində haylar hay salıb, qıy vururlar.

Bizim babamız, soyadımız olan Albanlardan bizi uzaqlaşdırıb özlərini Alban yurdunun varisləri elan ediblər. Xaça, xristianlığa qarşı kin, küdurət oyadıb özləri isə sonradan xristian olublar. Halbuki Albanlar xristianlığı ermənilərdən 270 il əvvəl qəbul etmişlər. Ermənilər xaçı bizə "pıxı", özləri üçün "çiçi" kimi təbliğ ediblər. Amma bizim ulu soylarımızın çoxunun damğası xaç şəklində olmuşdur. Qədim onomastik adlarımızın xaçla bağlı olması fikrimizi bir daha sübut edir: Məsələn, Xaçınyalı kəndi, Xaçbulaq yaylağı, Zümürxaç kəndi və s.

Ermənilər Azərbaycan xalqına qarşı yürütdüyü məhvetmə siyasətində ərəblərlə, farslarla bir nöqtədə birləşirlər. Belə ki, İslam dinini qılınc gücünə Azərbaycan xalqına qəbul etdirənlər bu xalqı ilkin mənəviyyatından, soy kökündən, inam və inancından, dinindən ayırıblar. Ermənilər də başqa prizmadan yanaşıb Azərbaycan xalqında xiristianlığa qarşı, xaça qarşı ikrah hissi oyadıblar. Bax bu iki məqam eyni nöqtədə birləşir. Hər iki yanaşmanın məqsədi Azərbaycan xalqını öz soy kökündən uzaqlaşdırmaqdır. Ermənilərin isə bu məsələyə belə yanaşmalarının iki məqsədi vardır. Birincisi Azərbaycan xalqının tarixən düşməni olan erməni bu xalqı məhv etmək, manqurdlaşdırmaq istəyir, ikincisi isə ondan irəli gəlir ki, özləri Azərbaycan xalqının soy kökü olan Alban tayfasının birinin adı altında gizlənmiş "hay" dır. Ona görə də Azərbaycan xalqını soy kökündən uazqlaşdırmağa hər an cəhd göstərir. Məlumdur ki, Albaniya 26 tayfanı əhatə etmişdir. Bu 26 tayfanın əksəriyyəti Türk tayfaları olmuşdur. Alban tayfaları Albaniya ərazisinin sahibi imiş. Bu ərazilərda "hay" tayfası yaşamayıbdır. "Hay"ların bu məkanda tarixən əraziləri olmayıb. Lakin bu ərazilərə köçürülən "hay"lar özlərinə əbədi məkan seçmək üçün "Ərmən" Alban tayfasının adı altında gizlənib, Albanyanın Ərmənlər yaşayan Ərməniyyə torpaqlarına sahib durublar. Odur ki. onlar heç vaxt razı olmazlar ki, azərbaycanlılar öz soy kökünə bələd olsunlar və xristian dininin onlardan əvvəl qəbul etmiş babalarını tanısınlar. Axı tarixdən məlumdur ki, Albanlar xristianlığı "hay"lardan 270 il əvvəl qəbul ediblər. Həmçinin bir də ona görə "hay"lar Ərmən Alban tayfasının adı altında gizlənmişlər ki, həm özlərini Albanların varisləri saysınlar, həm də guya xristianlığı əvvəlcədən qəbul etdiklərini sübut etsinlər.

Alban tayfalarından bu günümüzə qədər özünü qoruyub saxlayan və bu gün də öz qədim Alban milli qüruru ilə yaşayan İngiloylar Azərbaycanda 14,9 min nəfərdir. "İngiloylar (14, 9 min nəfər, 1999) dini mənsubiyyətinə görə xristian (gürcü pravoslav kilsəsi) və müsəlman ingiloylara ayrılır. Müsəlmanlar Zakatala rayonunun Əliabad, Mosul və Balakən rayonunun İtitala kəndlərində, xristian ingiloylar isə Qax rayonunun 9 kəndində yaşayırlar. Qədimdə onların yaşadıqları ərazi Kambisena (Ereti) adlanırdı və əsas əhalisi ingiloyların əcdadları hesab olunan er və qel tayfalarından ibarət idi. Burada Alban kilsəsi fəaliyyət göstərirdi. İngiloyların bir hissəsi sonradan zorla gürcüləşdirilmiş Alban tayfalarının qalıqlarıdır".(2,107)

Verilmiş sitatdan aydın olur ki, er tayfası Alban tayfası olmuşdur. Haylar bu tayfanın adı altında gizlənmişlər.

Lakin tarixi nə qədər saxtalaşdırsalar da, tarixin daş yaddaşı həqiqəti üzə çıxarır. Bunu ermənilərin öz yazarları da qələmə almışlar. Q.Kapantsyan "Xayasa-kolibel armyan" (Yerevan, 1948) əsərində qeyd etmişdir ki, ermənilər VII əsrədək Kiçik Asiyada Hayasa adlı əyalətdə yaşadıqlarına görə "hay" adlandırılmışlar. Buradan aydın olur ki, bunlar erməni deyil haydırlar. Bu gün də onlar bir-birindən millətini soruşduqda-hayes? – (ermənisən) - deyirlər.

Müasir elmi araşdırmaya əsasən erməni adlandırdığımız bu riyakarlıq çamurluğu Hind-Avropa mənşəli friqlərin bir qoludur. Ulu əcdadları eradan əvvəl XII əsrdə Balkanlardan Kçik Asiyaya köçmüş, Hayase əyalətində məskunlaşmış, e.ə VII əsrdə Urartu dövlətinə qatılmışlar. Urartulular onların bir hissəsini indiki Ermənistan ərazisinə köçürmüşlər.

Buradan aydın olur ki, erməni adlandırılan xalqın adı "hay"dır və yaşadıqları ərazi isə "Hayistan" adlanırmış. Ermənistan ərazisinə gəlmədirlər. Ermənistan qədim Alban tayfası olan Ərmənlərin yaşadıqları Ərməniyyə torpaqlarıdır.

Belə bir nəticəyə gəlmişəm ki, erməni dili də qədim Alban dili əsasında formalaşıbdır. Çünki, ermənilər buqələmun xalq olduğu üçün nə varsa assimliyasiya edir, özününküləşdirir. Odur ki, Alban mədəniyyəti bizə erməni dilində gəlin çatmışdır. Erməni kimi tanınan bu xalq Ərməniyyə torpağına yiyələnmiş haylardır. Haylar özgə malını, dilini, yerini, mədəniyyətini və s. tez mənimsəyən, ümumiyyətlə, buqələmun kimi nəsnədirlər. Bu fikri Alban dilini, mədəniyyətini, əlifbasını, ümumiyyətlə, Alban izini yer üzündən silib erməniləşdirən hayların tarixi gedişləri, durumları və xarakterik xüsusiyyətləri şərtləndirir. "Mingəçevirdəki qazıntı zamanı tapılan Alban əlifbası parçaları təsdiq edir ki, V-VII əsrlərdə Arranın öz yerli yazısı var idi və bu yazı ölkədə ərəb hökmüranlığı daha qurulmazdan əvvəl mövcud olmuşdur. Arranda yazılı mənbələr və ədəbiyyat xəlifə Əbd ül-Malikin (685-705) hökmranlığı dövründən başlayaraq məhv edilmiş və ya sıxışdırılıb

aradan çıxarılmışdır. Divanxanalar ərəb dilinə keçdi, Alban yazısı, habelə fars və Xarəzm yazıları, əhali içərisində savadlı təbəqələrin azlığı və qriqoryan kilsəsinin təzyiqi üzündən sıxışdırılıb unuduldu və təbii olaraq məhv oldu. Erməni dili Alban dilini əvəz etdi."(4,58.)

Bizim dövrümüz çoxəsirlik dünya qazanında bişmiş sinxronik bir aləmdir. Biz bu aləmdə şamanlıq, büdpərəstlik, hər bir şeyə tapınma, xristianlıq, islamçılıq və s. anlamları görə bilərik. Tarixin inkişaf xətti və fəlsəfi duyum, bunu bizə imkan verir deyək ki, bütün bəşəriyyətin son nöqtədə birləşmə ehtimalı labüddür. Çünki bəşər övladının başlanğıcı və sonu eyni nöqtədə dərk olunur. Yuxarıda söylənilən fikirlərin təsdiqini görkəmli filoloq alim, əmakdar elm xadimi, mərhum professor Mirəli Seyidovun "Azərbaycan xalqının soykökünü düşünərkən" əsərində tapa bilirik. M.Seyidov yazmışdır: "...Azərbaycan dili qəbilələrin, qəbilə birləşmələrinin eradan on dörd yüz il qabaq Azərbaycanda yaşaması haqqında bilgi vardır. Sonrakı yüzilliklərdə (IV-III) onlar burada elliklə yaşamış və vaxtaşırı el-el buraya gəlib qohum, qardaş qəbiləbirləşmələrinə qaynayıb-qarışmışlar.

Burada yaşayan və eradan qabaq axınla gələn türkdillilərin dili azı-azı eranın ilk yüzilliklərindən tutmuş ümümxalq danışıq dili qatına yüksəlirdi. Belə olmasaydı, aşağıda görəcəyimiz kimi, V yüzillikdə "Dəli Domrul boyu" Qafqazda, xüsusilə Ermənistanda, Gürcüstanda yayılmazdı və onun yaxından iştirakı ilə ilə əsərlər yaranmazdı. Musa Qağanqatlı əsərində göstərir ki, hələ eranın V yüzilliyində Qazan xan və onun qardaşı haqqında tarixi əfsanə, ola bilsin elə lap əsl əfsanə varmış. Və tarixçi onu az-çox dəyişikliklə əsərinə salmışdır. Ola bilsin ki, Qazan xan əfsanəsini tarixiləşdirmişdir. Demali Dəli Domrul əfsanəsi, Qazan xan tarixi əfsanə hələ V yüzillikdə Qafqazda Azərbaycan dilində yayılıbmış. Çoxdan-eradan 14 yüz il qabaq yaşamış və sonradan axın halında gələnlər Qafqazda türk dilinin qatını daha da artırmış və bu da Azərbaycan dilinin yayılma arealını genişləndirmişdir, tarixi şərait, ictimai mühit ətrafdakı dillərə təsir etməyə, qarşılıqlı ilişgilərə əsas yaratmışdır. Belə bir durumda mədəni, dil bağları daha da genişlənirdi. Eranın ilk yüzilliklərindən böyük axınla xəzərlər, az sonra hunlar və b. qəbiləbirləşmələri, xalqlar Qafqaza gəlirlər. Türk qatı böyüyür, genişlənir, ictimai durumu daha da möhkəmlənir. Belə bir durumun qonşu dillərə, xüsusilə erməni dilinə təsiri özünü açıqca göstərir. Bu dil hadisəsini duyan görkəmli bilici H.Acaryan əlli ildən çox müasir erməni dili (aşğarapar) ilə əski erməni dili (qrapar) arasındakı böyük, ciddi ayrılıq, fərq haqqında düşünmüş və axırda yazmışdır:

"Erməni dili strukturunun (sintaksis nəzərdə tutulur-M.S.) quruluşuna görə öz çevrəsində olan və onu işğal edən dillərin-latıncanın, yunancanın, fransızcanın. ərəbcənin, assoricənin və hətta kürdcənin strukturuna quruluşuna uyğun ola-ola birdən-birə bunlardan uzaqlaşır və türk-tatar dillərinin strukturuna oxşayır? Bu oxşayış tamam təsadüftirmi? Erməni dilinin struktur qurluşunun dəyişilməsinin səbəbləri yoxdurmu?" (H.Acaryan, Eeməni dilinin tarixi, Yerevan, 1951, səh.292)

H.Acaryan erməni dilindəki böyük dəyişikliklərdən bəhs edərək yazır ki, hər kəs qraparla aşgarapanı müqayisə edərsə ən kiçik məsələdə belə böyük müxtəlifliyi, fərqi görər. Müəllələif fikrini isbat etmək üçün bir çox qrammatik məsələləri misal çəkir. O, feldə, təyində və s. dəyişiklikləri göstərir. Erməni dilinin quruluşundakı ciddi dəyişikliyə H.Acarya VII yüzilliyin tarixçisi Hovhonnes Mamikonyanın, XI yüzilliyin şairi Heraqasinin dilində tuş olarkən təəccüblənmişdir.

Bizcə, Hovhonnes Mamikonyanın dilindəki dəyişiklik təbii dil hadisəsidir. Əgər Mamikonyanlarının köklərinin uğurlarla qan qohumluğu göz qarşısına gətirilərsə, onda məsələ az-çox aydın olar. Görünür ki, türkdilli Mamikonyanlar erməniləşərkən qraparın qrammatik quruluşunda istər-istəməz dəyişiklik etmişlər". (4, 436)

Buradan bir daha aydın olur ki, ermənilər türk tayfasının adı altında gizlənib dilinin qrammatik strukturunu da türk dilinin təsiri altında formalaşdırıblar.(6,56-61)

"Aparılan araşdırmalar və tədqiqatlar nəticəsində aydın olur ki, ermənilər müxtəlif vaxtlarda gah Əhəməni fars imperiyasının, gah Makedoniyalı İsgədərin, gah Azərbaycan-Atropatenanın, gah da türklərin hakimiyyəti altında olmuşlar. Onu da qeyd etmək lazımdır ki, ermənilər hansı dövlətin ərazisində yaşayırdısa, o dövlətin tarixini özününkü kimi qələmə verməyə, ona şərik çıxmağa başlayırdılar. Mənbələrin birində qeyd edilir ki, beləliklə,"süni şəkildə yazılan və təbliğ olunan "erməni xalqının tarixi" həqiqətdə ayrı-ayrı erməni olmayan etnik feodalların tarixidir".(4,25).

Bəxtiyar Tuncay və millət vəkil, tarix elmlər doktoru Fəzail ağamalının xidmətləri sayəsində 2010-cu ildə işıq üzü görmüş "Qafqaz Albanlarının dili və ədəbiyyatı" kitabı bütün Türk dünyası üçün bir müjdədir. Çünki bu kitab faktlara əsaslanır və bu günə qədər dünyanın gözünə kül üfürən hayların "Erməni qıpçaqçası" adlandırdıqları yazıların və ədəbiyyatın albanlara məxsus olduğunu birmənalı şəkildə sübut edir:

"...erməni və alban əlifbaları eyni mənşəli olsalar da, Yazılış xətt və üslubuna görə bir-birindən fərqlənirlər. Yəni hərflər eyni olsa da, xəttlər fərqlidir. Ermənilər "bolorqir" və "notrqir" adlandırdıqları bu iki xətti erməni yazısının iki fərqli xətti kimi təqdim edirlər. Gerçək isə budur ki, "bolorqir" ermənilərə, "notrqir" isə albanlara məxsusdur. Yəni əldə olan bütün alban mətnləri məhz "notrqir"lə yazılmışdır. Albanlar hətta erməni dilində yazanda da öz xəttlərindən (əlifbalarından) istifadə etmişlər. Odur ki, "notrqir"lə yazılmış bütün mətnlərin, o cümlədən ermənidilli mətnlərin müəlliflərinin məhz albanlar olduğunu tərəddüd etmədən söyləmək olar." (7,39.)

Ermənilər saxtalaşdırdıqları, yəni "alban" əvəzinə, "bütün ermənilərin katalikosu" və "alban kilsələrinin başçısı" əvəzinə, "bütün erməni kilsələrinin başçısı" şəklində yazdıqları sənədlərə əsasən sorğu etmək olar ki, ermənilər növbənövdür ki, "bütün ermənilər" "bütün ermənilərin kilsələri" ifadələri işlənir? Bəli, həqiqətən də belədir. Çünki erməni etnosu mövcud deyildir. Amma Albaniyanın ərmən tayfasının adı altında gizlənən haylar vardır və alban ərmən tayfasından olub erməniləşən ərmənlər də vardır. Hətta xristian tatlardan erməniləşən ermənilər də vardır. Odur ki, sənədləri saxtalaşdırdıqda "bütün" sözünü ora əlavə edirlər. Təklif edirəm ki, erməni sözünü leksikonumuzdan çıxarıb "hay" və "hayıstan" sözlərini işlədək. Belə etmiş olsaq "hayqanuşlar" əsil adlarını tanıyarlar və saxta qlafdan azad olduqlarını görərlər. Bütün dünyaya tanıtmaq lazımdır ki, bunlar "hay" tayfasının törəmələridi.

Son olaraq bir daha oxucu diqqətinə çatdırmaq istəyirəm ki, Xocalı yarasına, soyqırımına bənzər erməni-hayların millətimizə, soy kökümüzə vurduğu sağalmaz yaraları unutmayaq və lazım gəldikdə haqqımızı tələb etməyi, intiqamımızı almaq üçün, ağıllı tədbirlərlə, hər vasitədən istifadə edək.

## Ədəbiyyat

1. Nizami Gəncəvi. İsgəndərnamə (Şərəfnamə), Bakı, 2004.
2. "AME" Elmi Mərkəzi, Bakı, 2007.
3. Moisey Kalankatuklu. Albaniya tarixi, Bakı, Elm, 1993.
4. Mirəli Seyidov.Azərbaycan xalqının soykökünü düşünərkən, Bakı, Yazıçı, 1989.
5. Ziya Bünyadov. Azərbaycan VII-IX əsrlərdə, Bakı, 1989.
6. Əli Əliyev. Laçın qədim Oğuz yurdu, Bakı, 2009.
7. Bəxtiyar Tuncay. Qafqaz Albanlarının dili və ədəbiyyatı, Qanun Nəşriyyatı, 2010.

### February 26 is the day of Khojaly genocide. The incurable Khojaly wound is a genocide

### Summary

The purpose of the Khojaly genocide was accomplished with the participation of protector of Armenians - Russian soldiers and officers. The bloodthirsty, savage nature of the Russian chauvinists was written by Nizami Ganjavi, a 12th-century Azerbaijani poet who showed their characteristic features.

Armenians were always been in the same ideology with Arabs, Persians and Russians in the policy of extermination against our people since the day they arrived in Azerbaijan, ie since 1828.

### 26 февраля - день Ходжалинского геноцида. Неизлечимая Ходжалинская рана - это геноцид

### Резюме

Цель Ходжалинского геноцида была достигнута при участии русских солдат и офицеров - покровителями армян. Кровожадный, дикий характер русских шовинистов был написан Низами Гянджеви, азербайджанским поэтом XII века, который показал их характерные черты.

Армяне всегда были в одной идеологии с арабами, персами и русскми в политике уничтожения нашего народа со дня их прибытия в Азербайджан, то есть с 1828 года.

**Məqalə tarixçəsi**
Göndərilib: 18 yanvar 2020 Qəbul edilib: 22 yanvar 2020

## DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ

DOI: 10.36719/AEM/2007-2020/50/9-12
**Zərifə İsmayıl qızı Avilova**
**Zərifə Bayram qızı Məmmədova**
Azərbaycan Tibb Universiteti

# ELMİ ÜSLUB VƏ TERMİNLƏR PROBLEMİ

***Açar sözlər:*** *üslubiyyat, elmi üslub, üslub xüsusiyyətlər, elmi terminlər, alınma terminlər*
***Key words:*** *style, scientific style, style features, scientific terms, terms*
***Ключевые слова:*** *стиль, научный стиль, стилевые особенности, научные термины, заимствованные термины*

Müasir dövrdə elm sürətlə inkişaf edir. Bu proses isə ona aid ünsiyyət formasının daha da təkmilləşməsini tələb edir. İndiki elmi ünsiyyət özünün yığcamlığı, məntiqilik və dəqiqliyi ilə səciyyələnir. Elmi üslub bədii üslub qədər kütləvi xarakter daşımır. Belə ki, bədii üslub da yazılan hər bir parçanı oxuyanda və ya eşidəndə hamı başa düşür. Lakin elmi üslubda yazılan əsərləri xalqın bütün üzvləri dərk edə bilmir.

Azərbaycan ədəbi dilinin elmi funksional üslubu bədii üslubdan sonra formalaşmağa başlamışdır. Bu üslub tarix boyu geniş təkmilləşmə və zənginləşmə yolu keçmişdir. Hazırda elmin bütün sahələrinə mükəmməl elmi əsərlər yaradılmış və bu üslubda yazılar, əsərlər yaradılmaqdadır.

Fikrin elmi şəkildə ifadə olunması ədəbi dilin elmi funksional üslubu adlanır. Elmi üsluba, eyni zamanda, *elmi dil* də deyildiyinə rast gəlmək olur. Bu məqsədlə anlayış dəqiqliyi tələbinə müvafiq olaraq “elmi üslub” terminindən istifadə edilməsi məqsədə daha müvafiqdir.

Elmi üslub ədəbi dilin kitab üslublarına aiddir. Bu üslub bir sıra ümumi dil və üslub xüsusiyyətlərinə malikdir:

1. İfadənin əvvəlcədən düşünülməsi
2. Monoloq xarakteri
3. Dil vahidlərinin ciddi seçimi
4. Normaya meyllilik.

Elmi üslub ətraf mühit haqqında mümkün qədər dəqiq və ətraflı məlumat verir, hadisələrin səbəb-nəticə əlaqələrini aşkarlamaq, tarixi inkişaf qanunauyğunluqlarını müəyyən etmək və s. “Elmi üslub ifadənin məntiqi ardıcıllığı ilə, dəqiqlik, yığcamlıq, birmənalılıq ilə yanaşı мтика русского языка, əzmunun dolğunluğu ilə xarakterizə olunur. Burada emosionallıq və obrazlılıq yoxdur” (1, s.34). Sadəcə bəzən polemik xarakter daşıyan elmi əsərlərdə emosional ekspressiv və təsviri dil vasitələrinə rast gəlinir. Təbii ki, bu elementlər əsas elmi təhlil fonunda sadəcə əlavə bir üslub kimi istifadə olunur. Burada məqsəd fikrin daha inandırıcı şəkildə təqdim edilməsidir.

Elmi üslubun əsas xüsusiyyətlərindən biri terminlərlə, xüsusilə beynəlxalq terminlərlə zəngin olmasıdır. Digər xüsusiyyət isə abstrakt leksikanın geniş istifadə olunmasıdır. Elmi üslubda özünəməxsus frazeoloji birləşmələr də istifadə olunur. Onlar çox zaman mürəkkəb terminlər (məsələn, qalxanvari vəz, qaynama temperaturu, dönüş nöqtəsi, subyektiv fikir və s.) və klişelər (gəldiyimiz nəticə..., istifadə olunur... və s.). “Yazı ənənəsinə malik olan dünya dilləri yüzillər ərzində özünün ümumi elmi üslubunu yaratmışdır. İllər keçdikcə bu ümumi üslubun tərkibi mikroüslublarla, üslub variantları ilə genişlənib inkişaf etmişdir” (2, s.216).

Elmi üslubun başqa üslublardan fərqli cəhətləri ondadır ki, bu üslub elmi əsərlərin dili olmaqla, məlumat vermək, bu məlumatı məntiqi əsaslarla sübut etmək xüsusiyyətinə malikdir.

Elmi ülsubun səciyyəvi cəhətləri öyrənilərkən iki məsələyə: elmi üslubun formalaşmasında linqvistik və ekstralinqvistik amillərin roluna və elmi üslubun başqa, xüsusilə bədii üslubdan fərqli əlamətlərinə xüsusi diqqət yetirmək lazımdır.

Elmi üslubun linqvistik ifadə vasitələri onun ekstralinqvistik problemləri ilə sıx bağlıdır. Elmi üslubun sahəsi çox genişdir. Daha doğrusu, elmi üsluba daxil olan elmi əsərlərin hamısı eyni səciyyəli olmur. Məsələn, riyaziyyata dair yazılmış elmi əsərlərlə hər hansı bir ictimai elmə aid yazılmış əsər dil etibarilə bir-birindən fərqlənir. Xüsusi elmi əsərlərlə yanaşı elmi-kütləvi, elmi-tədris əsərləri də vardır. Xüsusi elmi əsərlər müəyyən elm sahəsindəki nəzəri fikirlərin ümumiləşmiş formaları və ya müəyyən tədqiqatın nəticəsidir. Elmi tədris və tədrislə bağlıdır. Burada tədrislə əlaqədar müəyyən tapşırıqlar, çalışmalar verilir

ki, bunlar xüsusi elmi əsərdə və elmi kütləvi əsərlərdə olmur. Geniş oxucu kütləsi üçün yazılan elmi-kütləvi əsərlərin üslubu bədii üsluba yaxın olur.

D.N.Şmelev dil vasitələrinin üslublar arasında diferensayisasından danışarkən göstərir ki, dil vasitələrindən istifadə üslubun “qapalı üsluba” çevrilməsində mühüm rol oynayır; ifadələr, sözlər standartlaşır. Belə standartlaşma birinci növbədə, rəsmi üslubda, sonar isə elmi üslubda qabarıq nəzərə çarpır (3, s.80).

Elmi üslubun spesifik xüsusiyyətləri, onun leksik və qrammatik ifadə vasitələri tədqiqatçıların nəzər-diqqətini cəld etmişdir. Son illərdə elmi üslubun leksik-qrammatik xüsusiyyətinə aid bir sıra əsərlər çap edilmişdir.

Dilçilik ədəbiyyatında dil vasitələrinin üslubi diferensasiyasından danışılarkən ilk əvvəl leksik xüsusiyyətlədən bəhs edilir. Çünki üslubların leksik diferensasiyası morfoloji və sintaktik imkanların diferensasiyasına nisbətən tez hiss olunur. Doğrudur, bütün üslubların leksikasında ümumxalq dilinin lüğət əsasdır. Məqsəddən, mövzudan asılı olaraq dilin lüğət tərkibindən sözlər məntiqi-semantik ardıcıllıq əsasında seçilir, məqsəddən asılı olaraq bəzən həqiqi, bəzən isə məcazi mənada işlənir. Üslubların leksikasından bəhs edərkən sözləri istər-istəməz iki qrupa bölmək lazım gəlir ki, bu da üslubun mahiyyəti ilə bağlıdır.

Funksional üslubların başqa qatlarında olduğu kimi, leksik qatda da elmi üslubun daxili yarımüslubları nəzərə alınmalıdır. Sırf elmi əsərlərin leksikası ilə elmi-kütləvi və tədris vəsaitlərinin leksikası arasında fərq vardır.

Tədris vasitələrində elmi-texniki yerminlərin işlənməsində müəyyən xüsusiyyətlər nəzərə çarpır. Tədris vəsaitləri tələbələrə bu və ya digər elm sahəsində müəyyən məlumat verməklə yanaşı, onun yadda qalmasına, mənimsənilməsinə xidmət edir. Yeni termin dərsliyə müəyyən izahatla daxil edilir.

Terminlərin mənimsənilməsində elmi təriflərin böyük əhəmiyyəti vardır. Təriflər bir tərəfdən məsələnin mahiyyətini ifadə edirsə, digər tərəfdən də terminin mahiyyətini açır.

Tədrisdə terminlərin yadda qalması üçün onların qara hərflərlə yazılmasının böyük rolu vardır. Terminin qara hərflə yazılmasında görmə yaddaşı da məsələnin mahiyyətinin mənimsənilməsində kömək edir.

Elmin və texnikanın yayılmasında elmi-kütləvi ədəbiyyatın böyük rolu vardır.

Dilçilik ədəbiyyatında elmi əsərlərin leksikasından danışılarkən ilk növbədə onun termin zənginliyi qeyd edilir. Terminlər elmi əsərin üslubun müəyyənləşdirməklə bərabər hər bir əsərin elmin hansı sahəsinə aid olduğunu əyani şəkildə göstərir, hətta yarımüslubların müəyyənləşdirilməsinə kömək edir. Buna görə də elmi əsərin leksikasının izahını terminlərdən, terminlərin elmi əsərdə işlənmə əmsalından başlamaq lazımdır.

İstər morfoloji, istərsə də sintaktik imkanlara görə üslubları fərqləndirmək, çətin olur. Leksik quruluş bu çətinliyi aradan qaldırır. Yəni cümlə və ya xəbərin morfoloji ifadə vasitəsinə görə bir-birindən fərqlənməyən elm sahələri leksikaya görə o saat müəyyənləşir.

Hər bir elm sahəsinin özünəməxsus terminləri olur ki, bu terminlər elmi üslubu başqalarından fərqləndirməklə bərabər, ona daxil olan sahələri də bir-birindən fərqləndirir.

Elmi ülsuba və ümumiyyətlə terminlərə aid xüsusiyyətlərdən biri danışıqda işlənən adi sözün elmi üslubda terminləşməsidir. Əlbəttə, belə bir cəhət elmi üsluba xas olduğu kimi, termin yaradcılığının əsas yollarından biridir. Ümumxalq dilində işlək olan sözlər elmi üslubda terminləşir. *İrinləmə, ağrıma, ağrı, harın, burun, düşmə, mıx, yük, iynə, əlil, dəyənək* və s. ümumxalq danışıq dilinə aid sözlər cərrahlıqda termin sayılır. Yaxud, *ayaq, beyin, böyrək, qan, döş, göz, ürək, dəri* və s. zoologiyada termindir.

Müxtəlif elm sahələrinə aid terminlərin yaranmasında bu terminlərin elmi üslubun səciyyəvi əlamətlərindən biri olması qabarıq bir şəkildə gözə çarpır.

Cərrahlıq terminləri:

*İrinləmə, qansız, ağrıma, ağrılı, ağrı, qarın, burun, köpmə, sorulma, çıxıq, biçmə, düşmə, mıx, mıxlama, sarılıq, iynə, ölçmə, əlil, dəyənək.*

Zoologiya terminləri:

*Ağız, ayaq, ağciyər, bağırsaq, balalıq, barama, beyin, böyrək, qan damarları, qanad, dəri, dodaq, döş, yumurta, kəllə, kirpik, göz, tər, ürək,* xorda.

Dənizçilik terminləri:

*Dəniz, çay, boğaz.*

Rabitədə işlənən *sarğı,* geologiyada işlənən *qodu, zirvə, yosun, mum, gil* və s. onlarca terminlər ümumişlək sözlərin elmi üslubda konkretləşməsi nəticəsində yaranmış terminlərdir. Bir daha qeyd etmək yerinə düşər ki, bədii üslubda, danışıqda bunlar termin deyil, mənaları çox zaman konkretlikdən uzaqdır.

Elmi əsərlərin leksik tərkibi terminlərlə doydurulur, elə mətnlərə təsadüf edilir ki, ancaq mətn terminlərdən ibarət olur. Bununla belə, əsərin leksikasının tamamilə terminlərdən ibarət olduğunu söyləməkdə doğru olmaz. Çünki elmi leksikanın əsas onlarca qüvvəsi olan terminlər yan-yana düşməklə iş

bitmir. Elmi əsərlərdə fikir tamlığı mətnin ardıcıllığı və irəli sürülən məsələ haqqında müəyyən bir hökm terminlərlə deyil, elmi üsluba məxsus müəyyən sözlərlə ifadə edilir.

Beləliklə, elmi üslubda terminlərlə yanaşı elmi üsluba məxsus sözlər də səciyyəvidir. Bunlara ən çox feillər daxildir: *əmələ gəlmək, rast gəlmək, təsir etmək, təşkil etmək, yerləşdirmək, yaratmaq, malik olmaq, iştirak etmək, istifadə etmək, əhatə etmək, qeyd etmək, tələffüz etmək, ifadə etmək, adlanmaq, uğramaq, təsvir etmək, gözə çarpmaq, səbəb olmaq, hesab etmək, deyilmək* və s.

Dilin leksik tərkibindən danışılarkən abbereviaturlar-ixtisarlar söz yaradıcılığının müəyyən növü hesab edilir. İxtisarların bir növü, daha doğrusu, əsasən numerativ xarakterli sözlərin ixtisar formasının işlənməsi əsas elmi üsluba xasdır. Bədii üslubda tam işlənən numerativlər elmi üslubda ixtisar edilir:

Kətmənin ağırlığı kiloqram yarım, ağzının eni 25-26 santımetr, hündürlüyü 23-28 santımetr olmalıdır. Hər hektardan ən azı səksən sentner məhsul götürməli (Ə.Vəliyev). Bədii əsərdən verilmiş bu parçadakı *kiloqram, santımetr, hektar, sentner* sözləri elmi üslubda mütləq ixtisar şəklində işlənəcəkdir: *kq, sm, hek, sent.*

Məsələn:

Düzgün üçbucaqlı kəsik pramidanın hündürlüyü 7 smdır. Oturacaqlarının tərəfləri 10 sm və 20 smdır; Mis naqilin müqaviməti 0,2 sm və kütləsi 0,2 kq olarsa, onun uzunluğu və en kəsiyinin sahəsini təyin edir.

Elmi əsərlərin leksikasında nəzərə çarpan cəhətlərdən biri də müəyyən qanunların ixtisarçısının adının ümumiləşməsi, ölçü vahidinə çevrilməsidir ki, bu sözlər də leksik qat təşkil edir: Avoqadro ədədi, Broun hərəkəti, Boyl-Mariot qanunu, Mendelyev-Klapeyron tənliyi, Torçelle boşluğu, om, bolt, amperimetr kimi sözlər və birləşmələr bunlara misal ola bilər.

Bədii əsərlərdən, xüsusilə bədii üslubun leksik xüsusiyyətlərindən danışılarkən məcazlaşma əsas amil kimi göstərilir. Çünki bəddi dil obrazlı dildir. Bu baxımdan bədii əsərlərin leksik tərkibi elmi əsərin leksik xüsusiyyətlərinə qarşı qoyulur. Elmi üslubda məcazlaşma olmadığı göstərilir. Bununla elmi üslubda da obrazlı sözlərə, obrazlı ifadələrə rast gəlmək mümkündür. Lakin əvvəllərdə göstərildiyi kimi, bu obrazlı ifadələr, sözlər elmi üslubda səciyyəvi xüsusiyyətini təşkil etmədiyi kimi, onun ümumi spesifikasına da xələl gətirmir.

Anlayışı düzgün ifadə etməyən səhv terminlərin yaranması obyektin düzgün izahedilməməsinin nəticəsidir.

Azərbaycan dilçilik terminlərindən danışarkən iki məsələni xüsusilə qeyd etmək lazımdır. Bunlardan biri termin paralelliyi və termin müxtəlifliyidir. Dilçilik əsərlərində müəyyən terminlər ua paralel, ya da bir əsərdə biri, digərində isə başqası işlənir. Məsələn, abstrakt-mücərrəd, fəal-aktiv, bədii-obrazlı, fasilə-pauza-durğu və s. Əlbətdə, bu terminlər qismən eyni olsalar da, bunlardan birinin sabitləşməsi lazımdır.

Bir çox terminlər izahlı şəkildə işlənir. Beləki, ya beynəlxalq termin Azərbaycan dili sözləri ilə, ya da Azərbaycan dili materialları əsasında düzəlmiş termin beynəlmiləl terminlə izah edilir: eliziya – səsdüşümü, avazlayan – rezonator və s.

Dilçilik terminləri ilə əlaqədar ikinci mühüm məsələ termin qıtlığıdır. Dilçilik elminin müasir səviyyəsini əhatə edən bir çox terminlərin qarşılığı dilimizdə yaranmamışdır. Elmlərin bir-birinə yaxınlığı və elmi mteqrasiya ilə əlaqədar olaraq elmi üslubda elm sahələri ilə bağlı olaraq eyni bir terminin müxtəlif mənada işləndiyi nəzərə çarpır.

Elmi üsluba və ümumiyyətlə terminlərə aid xüsusiyyətlərdən biri danışıqda işlənən adi sözün elmi üslubda terminləşməsidir. Əlbətdə, belə bir cəhət elmi üsluba xs olduğu kimi, termin yaradıcılığının əsas yollarından biridir. Ümumxalq dilində işlək olan sözlər elmi üslubda terminləşir. Məsələn, *ağrıma, ağrı, burun, düşmə, yük, iynə, əlil* və s.

Elmi əsərlərin leksik tərkibi terminlərlə zəngindir. Lakin, əsrin leksikasının tamamilə terminlərdən ibarət olması da doğru deyil. Çünki elmi əsərdə terminləri yan-yana düzmək doğru deyil. Elmi əsərlərdə fikir tamlığı mətnin ardıcıllığı və irəli sürülən məsələ haqqında müəyyən bir hökm terminlərlə deyil, elmi üsluba məxsus müəyyən sözlərlə ifadə edilir.

Beləliklə, elmi üslubda terminlərlə yanaşı elmi üsluba məxsus sözlər də səciyyəvidir. Bunlara ən çox fellər daxildir: *əmələ gəlmək, rast gəlmək, təşkil etmək, istifadə etmək, hesab etmək, gözə çarpmaq, səbəb olmaq* və s.

Elmi üslubda obrazlı ifadələrin, sözlərin işlədilməsi, elmi üslubun yarımüslubları və elmi üslubun əhatə dairəsi ilə bağlıdır. Belə bir cəhət xüsusilə ictimai elmlər sahəsində yazılmış elmi əsərlərə aiddir. Yəni texniki elmlərə nisbətən ictimai elmlərə dair yazılmış əsərlərdə obrazlılıqdan çox istifadə edilir:

Qız qalası Bakının qədim və möhtəşəm abidələrindən biridir. Zəmanəmizə qədər gəlib çatmış bu qala Azərbaycanda, xüsusilə Bakıda baş vermiş bir çox hadisələrin şahidi olmuş, onun hər bir daşının altında bu şəhərin bir çox sirri gizlənmişdir. Bakı Qız qalası öz əzəmət və möhkəmliyinə görə Yaxın Şərqdə olan orta

əsr abidələri sırasında mühüm yer tutur. Elə bir adam tapmaq olmaz ki, bu abidənin qarşısında dayandıqda onun nə zaman və nə üçün tikilməsi barədə düşünməsi (Bakı Qız qalası, s. 3). Tarixə - arxeologiyaya aid bu elmi parçanın obrazlılığı göz qabağındadır. Lakin belə bir leksika elmi əsərin hamısına xas deyildir.

Gördüyümüz kimi elmi üslub çoxşaxəli və əhatəli bir dilçilik məsələsidir. Onun tədqiqi və təhlili vacib və, ən başlıcası, aktualdır. Çünki biz elm və texnika, innovasiyalar əsrində yaşayırıq. Bütün bunlar isə mütləq dilə və dildə gedən proseslərə siraət edir. Elmi üslubun əsas sütunu isə təbii ki, elmi terminlərdir. Elmi terminlər dilin vacib tərkib hissəsidir.

**Ədəbiyyat**

1. Д.Э.Розенталь. Практическая стилистика русского языка. М., 1987, с.34
2. A.Qurbanov. Ümumi dilçilik. Bakı, Elm, 2011. s.216
3. Д.Н.Шмелев. Русский язык в его функциональных разновидностях. М., Наука, 1977

**Problems of scientific methods and terms**

**Summary**

The scientifically functional style of the Azerbaijani literary language began to take shape after the artistic style. This style has gone a long way in improving and enriching throughout history. Perfect scientific works have been created in all areas of science, and writings and works are being created in this style. Scientific style is a multidisciplinary and comprehensive linguistic issue. Its research and analysis are important and, above all, relevant. Because we live in the age of science, technology and innovation. All of this is a reference to the language and processes of language. The main pillar of the scientific method is scientific terms. Scientific terms are an important part of the language.

**Проблема научного стиля и терминов**

**Резюме**

Научно-функциональный стиль азербайджанского литературного языка начал формироваться после художественного стиля. Этот стиль прошел долгий путь в улучшении и обогащении на протяжении всей истории. Совершенные научные работы были созданы во всех областях науки, и сочинения и работы создаются в этом стиле. Научный стиль является междисциплинарной и всеобъемлющей лингвистической проблемой. Его исследования и анализ важны и, прежде всего, актуальны. Потому что мы живем в век науки, технологий и инноваций. А все это, в свою очередь, отражается в языке. Основной опорой научного метода являются научные термины Научные термины являются важной частью языка.

**Rəyçi: dos. X.Məhərrəmova**

**Məqalə tarixçəsi**
Göndərilib: 18 yanvar 2020 Qəbul edilib: 23 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/13-13
**Fəridə Mürşüd qızı Mikayılova**
ADPU- nun Ağcabədi filialı

# QAZAX, QARABAĞ, GƏNCƏ DİALEKTLƏRİNİN OXŞAR VƏ FƏRQLİ XÜSUSİYYƏTLƏRİ

(Tezislər)

***Açar sözlər:*** *şifahi nitq, dialekt, tarixi-coğrafi*
***Key words:*** *oral speech, dialect, historical and geographical*
***Ключевые слова:*** *устная речь, диалектический, историко-географический*

Dialektizmlər əsasən şifahi nitqdə, məişət danışığında istifadə olunur və dilin lüğət tərkibinə ehtiyat, baza rolunu oynayır. Azərbaycan dialekt və şivələri ilk dəfə 1924-cü ildə SSRİ Elmlər Akademiyasının müxbir üzvü N.İ.Aşmarin tərəfindən tədqiq edilməyə başlanmışdır.

Hazırda ali məktəblər üçün ən sanballı vəsait M.Şirəliyevin "Azərbaycan dialektologiyasının əsasları" kitabıdır. Kitab ilk dəfə 1967-ci ildə Maarif nəşriyyatı, təkrar "Şərq-Qərb" nəşriyyatı tərəfindən 2008-ci ildə nəşr olunmuşdur. Kitabda Azərbaycan dialekt və şivələri tarixi-coğrafi prinsip əsasında dörd qrup ətrafında cəmləşdirilmişdir ki, Qazax, Qarabağ, Gəncə dialektləri və ayrım şivəsi ikinci qrupa daxil edilmişdir.

Dialektizmlər sadə danışıq sözlərinin məhdud ərazidə bir və ya bir neçə şivədə işlənməsinə görə də seçilir, bəzən yaxın ərazilərdə yaşayanlar üçün belə fikrin anlaşmasını çətinləşdirir. Qazax, Qarabağ, Gəncə dialektləri eyni qrupa daxil edilsə də, bir çox fərqliliklər mövcuddur. Məlumdur ki, dialektizmlərin əsas xüsusiyyətlərindən biri də qədim sözləri, tarixiliyi öz tərkibində qoruyub saxlamasıdır. Belə ki, Qarabağ dialektində bol, ruzi-bərəkət mənasında, "şülən" köhnə mənasında "nikolaydan qalma", "yaşlı mənasında", "Şah Abbası qundaqda görüb" ifadələri işlənir ki, bunlara Qazax və Gəncə dialektlərində rast gəlinmir. "Kitabi-Dədə Qorqud" dastanında "şülən" sözü qonaqlıq, yemək, ruzi mənasında verilmişdir. "Firon" isə e.ə. aid hökmdar anlamındadır. Eləcə də Qazax dialektində "kapot" (qadın paltarı), "qondara" (dabanlı qadın ayaqqabısı) yengə (qardaş arvadı) dialektizmləri Qarabağda işlənmir və anlaşılmır. M.P.Vaqifin qoşmalarından bir çox Qazax dialektizmləri Qarabağ danışıq dilinə keçmişdir.

Laçın tək başında ala tomağa (tac)
Ucu tər cığalı siyah tellərin (ucu təravətli qıvrım saç) yaxud,
Səni sevən hər bəlaya tuş gəlir. (rast gəlmək) mənasında işlənmişdir. Yeri gəlmişkən Cığatel antroponimi Qazax bölgəsində geniş yayılmış adıdır. Bundan başqa M.P.Vaqifin "Ala gözlər can almağa sayılır" misralarındakı "sayrılır" dialekti S.Vurğunda "sayrışan" (Bakının sayrışan ulduzlarından) kimi verilmişdir.

Bununla yanaşı Qazax, Qarabağ, Gəncə dialektləri üçün ortaq xüsusiyyətlər də çoxdur. Bunlardan biri də mən, sən şəxs əvəzliklərinin yönlük hal şəkilçiləri qəbul edərkən mənə, sənə formasında tələffüz edilməməsi, həm də ahəngə görə -ə deyil, -a səsinin uzanaraq -maa, -saa kimi deyilməsidir. Hesab olunur ki, burada dilin lüğət tərkibindəki tarixilik özünü göstərir. Belə ki, türkmən dilində bu əvəzliklər yönlük halda mana, sana, tatar dilində muna, suna kimi deyilir və yazılır.

Bütün bunlar göstərir ki, Qazax, Qarabağ, Gəncə dialektlərinin araşdırılması, tədqiq edilməsi vacib, aktual məsələlərdəndir.

## Ədəbiyyat

1. Azərbaycan dilinin Qərb qrupu dialekt və şivələri. EA nəşriyyatı, Bakı-1957.
2. M.Şirəliyev "Azərbaycan dialektologiyasının əsasları". "Şərq-Qərb" nəşriyyatı, Bakı-2008.

**Rəyçi: dos. S.R.Məmmədov**

**Məqalə tarixçəsi**
Göndərilib: 16 yanvar 2020 Qəbul edilib: 21 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/14-17

**Zərifə Bayram qızı Məmmədova**
**Zərifə İsmayıl qızı Avilova**
Azərbaycan Tibb Universiteti

# MONOLOJİ NİTQİN LİNQVO-PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *mətn, nitq, monoloq, çıxış, məruzə, mühazirə, psixoloji aspekt*
***Key words:*** *text, speech, monologue, speech, lecture, psychological aspect*
***Ключевые слова:*** *текст, речь, монолог, выступление, лекция, психологический аспект*

Müəyyən kollektivin digər üzvləri ilə əlaqə saxlamaq məqsədilə dildən istifadə edən şəxsin fəaliyyəti, danışığı nitq adlandırılır. Dilin mövcudluğu üçün nitq zəruridir. Hər hansı dilin sistemini yalnız nitqdəki təzahürünə görə müəyyənləşdirmək olur. Nitq nəinki dili təzahür etdirir, həm də onu inkişaf etdirir, formalaşdırır. Nitq fəaliyyətdə, yəni öz funksiyasını yerinə yetirməkdə olan dildir, nitq aktıdır. "Dil ünsiyyət vasitəsidirsə, nitq ünsiyyətin özüdür" (1, s.99).

Dialoji nitqlə müqayisədə monoloji nitq struktur baxımından sadədir. Fikir bir nəfər tərəfindən geniş və ya müxtəsər şəkildə, rabitəli bir tərzdə ifadə edilir. Burada danışanın müsahibi (və ya müsahibləri) ilə əks əlaqəsi olmur. Monoloji nitqdə məqsəd nitqin əsas kommunikativ növlərindən (təsvir, təsdiqləmə, fikir söyləmə, səciyyələndirmə) istifadə etməklə hər hansı bir məzmunun başqasına çatdırılmasıdır. Yəni danışan deyəcəklərini əvvəlcədən düşünür, ifadə edəcəyi fikrin həcmini, xarakterini müəyyənləşdirir, müəyyən fərdə və ya auditoriyaya müraciət formasını, dil materiallarını seçir, müsahibinin (müsahib-lərinin) səviyyəsini, deyəcəklərinin ona (onlara) necə təsir edəcəyini təsəvvüründə canlandırır. Nitqin bu formasında danışan fikrən və ya yazılı şəkildə plan tutur, şərh edəcəyi məzmunu vermək üçün ona, necə deyərlər, dil donu geyindirir. Hansı sözlərdən, ifadələrdən istifadə edəcəyini, nitqini necə başlayacağını və quracağını və s. özü üçün müəyyənləşdirir.

Nitqin ən çox yayılan növü çıxışdır. Çıxış-məsul şəxs qarşısında başqalarının monoloji nitqidir. Çıxışda söz alıb danışanın nitqi hansı münasibətlə deyilməsindən asılıdır. Söz sahibinin mövqeyi, həyatda tutduğu yer, yaxınlıq, dəstluq münasibəti, harada kimin və ya kimlərin qarşısında söz deməsi kimi məsələlər çıxışın ahənginə, tonuna ciddi təsir göstərir. Natiqlik məharəti odur ki, natiq özündən əvvəl çıxış edənlərin dediklərini təkrarlamadan, dilin fonetik, leksik vasitələrindən qrammatik normalar daxilində, zəngin lüğət tərkibindən fikrini orijinal şəkildə ifadə edə bilsin. Çıxış kiçik vaxt kəsiyində, adətən, plansız, konspektsiz ərsəyə gəlir. Lakin elmi konfranslarda hansısa fakta, düstura, cədvəl və rəqəmlərə ehtiyac əlarsa, çıxış edən şərh edəcəyi məsələni müəyyən plan üzrə qeydlər əsasında apara bilər. Natiq üçün əsas keyfiyyət onun yaddaşıdır. Açıq havada, izdihamlı kütlə qarşısında və ya böyük auditoriyada canlı təmas şəraitində çıxış edənlər yeri gəldikcə əl-qol hərəkətlərindən, mimikadan da faydalana bilər. İfadəli hərəkətlər sözlə ifadə olunan mənanı nəzərə çarpdırarkən mənaya ekspressivlik verir, nitqi daha təsirli edir. Danışanın əl, qol hərəkətlərinə yol verməsi, üz, qaş hərəkətlərini icra etməsi, dodaqlarını çeynəməsi, göz eləməsi, dodağını dişləməsi, ağzını marçıldatması (şirin və ya yaxşı nəyəsə işarə etməsi) və s. şifahi nitqdə əlavə emosiya, təsir vasitəsidir və məqamında, şəraitdən asılı olaraq müsbət sayılsa da, ciddi məsələlər haqqında danışarkən bunlar yol verilməzdir. Monoloji nitqdə ifadəli hərəkətlərdə müəyyən ölçü gözlənilməli, lüzumsuz mimika və jestlərdən istifadə olunmamalıdır. Ekran və efir şəraitinən istifadə hesabına öz çıxışını təsirli və effektli olması qayğısına qalmalıdır.

Monoloji nitqin digər növü isə məruzədir. Çıxışdan fərqli olaraq məruzə iştirakçılar arasında geniş müzakirə olunur, məruzə ətrafında çıxışlar edilir və yekunda müvafiq qərar qəbul olunur. Məruzə, əsasən, elmi, bəzən də publisistik üslubda yazılır.

Mühazirə natiqlik üslubunun çətin, lakin ən geniş yayılmış növüdür. Mühazirəyə ən çox ali məktəbin tədris sistemində rast gəliniri Mühazirə oxuyan professor və ya dosent fikirlərini elmi ədəbiyyata əsaslanmaqla qurur, mühazirənin sonunda isə istifadə olunmuş ədəbiyyatın siyahısını da tələbələrə çatdırır. Həm ali məktəb mühazirələri, həm də kütləvi (müəyyən yerlərdə, müəyyən mövzularda, məsələn, ölkə həyatına, xüsusən, ölkə prezidentinin əməli siyasətinə aid məsələlərə həsr olunmuş) mühazirələr konkret faktlara əsaslandığı üçün mühazirəçinin (lektorun) ustalığı nəticəsində maraqla qarşılanır, ümumi işin xeyrinə olur. Belə mühazirələrdə ara-sıra dialoji nitq elementlərinə də yer verilir.

Məruzə və mühazirəni fərqləndirən cəhətlər aşağıkılardır.

бастайтын қайратты төзім бар. Ал Байсал мүлде бөлек қасиетімен танылады. Қырындай қарауы оған тән қандай нәрсеге де дайын, ерік-жігерге толы күресшіл мінездің нышанын танытады.

Құнанбай алыс-жұлысқа, арпалысқа ғана емес, сөзге де жүйрік, шешен, тілі өткір, тиген жнрі тіліп түседі. Осылардың бәрі Құнанбайдың өз ортасынан биік, оқшау тұрған, жоталы тұлға екенін көрсетеді және оның осындай өзгеше бөлек бітімін өз ортасы да әбден мойындап болған.

Өзі билік жүргізген атыраптағы қазақты бұқтырып, орысты ықтырып, бәрін өз алдында құрдай жорғалатқан Құнанбайдың философиясы да, дипломатиясы өз басына жетерлік. Ол мықты болмаса, онымен тартысқа түскен Абайдың да ірілігі көрінбес еді.

Алғашқы кітапта Абай адам, азамат ретінде қалыптасса, ал кейінгіде ақын, қайраткер ретінде қилы қимыл-әрекетке көшкен.

Әдебиеттанушы Р.Бердібай еңбектерінің ішінде әдебиеттану ғылымының теориялық мәселелерін арнайы сөз еткен «Тарихи романы» тұтас М.Әуезовтың әңгіме, повестері мен «Абай жолы» романын қатар алып, жүйелі талдау әдісі мен салыстырмалы зерттеуге арналған.

Әдебиетті зерттеу тәсілін мейлінше терең игерген ғалым ретінде ол әр шығармаға ұлттық танымның әдеби-теориялық құндылықтары үрдісінен қарады. Сөйтіп әлемдік әдебиет талаптарына толық жауап бере алатын І.Есенберлин, Ә. Кекілбаев, Ә.Әлімжанов, М. Мағауин тарихи романдарына жаңашыл көркемдік-эстетикалық таным биігінен көз салды. Осынау жазушылар шығармашылығына 60-жылдардың екінші жартысынан бергі кезеңдегі қазақ әдебиетінің дамуындағы ұлттық құбылыс ретінде ой жіберіп, тақырыптық, идеялық, көркемдік ізденістерінің сырын ашуға ұмтылыс жасады. Олардағы ортақ үндестіктер мен әр автордың, жеке шығарманың өзіндік ерекшеліктерінің сыр-сипатын, нақты көрсете алды. Аталмыш қаламгерлердің белгілі шығармаларындағы («Көшпенділер», «Үркер», «Махамбеттің жебесі», «Аласапыран» т.б.) ерекшеліктер белгілі бір шығармаға тән тарихи оқиға мен халық тағдырында ірі міндеттер атқарған тарихи қаһармандар іс әрекетінің әр келкілігінен және әр жазушының тарихи деректі өз туындысына пайдаланудағы жеке дара қабілет-мүмкіндіктеріне байланысты екендігін білгірлікпен айқындап берді. Ғалым қашанда қазақ әдебиетін өзге әлемдік әдебиеттен бөліп алып, томаға тұйық жеке дара күйде қарауға қарсы. Ол үнемі қазақ әдебиетіндегі тарихи тақырыптың көтерілу деңгейін өзге ұлттар әдебиетімен салыстырмалы түрде салғастырып, олардағы көркемдік сабақтастықтардың дәстүрлік негізін ашуға тырысады. Мәселен Әділ Якубовтың «Ұлықбектің қазынасы» атты тарихи романының идеялық бағдары мен сюжеттік өрімінен қаһармандар мінездемесін іздестіруі осының нақты айғағы.

Ойымызды қорытар болсақ, Р.Бердібайдың фольклордан бастау алатын зерттеу еңбектері мен әдеби сын мақалалары, мерзімді басылымға жарияланған еңбектері, әдебиеттану ғылымының әр саласында ізденіс жасап, әдебиет теориясының проблемаларын, соның ішінде, шығармадағы тартыс, кейіпкерлердің қарым-қатынасындағы қақтығыстан өзге көркем шығарманың поэтикалық мәселелері, тип, прототип, пейзаж, портрет, стиль мәселелері жөнінде де жасаған терең талдаулары қазақ әдебиетіндегі әдебиет теориясының маңызды мәселері ретінде ерекше бағаға ие.

**Пайдаланған әдебиеттер**

1. Ысқақұлы Д. Қазақ әдеби сынының тарихы. Екінші том. Алматы. «Қазығұрт», 2011
2. Бердібай Р. Бес томдық шығармалар жинағы. –Алматы. «Қазығұрт»-2005.Тарихи роман. Мұхтар шыңы. Үшінші том. -448 б.
3. Ергөбек Қ. Арыстар мен ағыстар. 1-кітап. Алматы -2003.
4. Әбдиманұлы Ө. Ғұлама //№8 2014 Ақиқат 65-72 беттер
5. Жарылғапов Ж.Ж. Қазақ прозасы: ағымдар мен әдістер: монография. – Қарағанды: Гласир, 2009. – 400 б
6. Бердібаев Р. Тарихи роман. – Алматы: Санат, 1997. – 336 б.

**Problems of the theory of literature in kazakh literature**

**Summary**

This article discusses the theory of literature in the research of R.Berdibay and Kazakh literature. From a comparative analysis of the plot and compositional structure, starting with the genre and ideological specifics of the work of art, he expands our understanding of the general appearance and interior of the novel, as well as the evolution of works on a historical theme.

In the works of Academician R.Berdibay, the issues of poetics of types, prototypes, landscapes, portraits and styles, as well as the problems of conflicts among heroes, are examined in detail. The author analyzes the similarities between the characters of the story and the novel by M.Auezov, the characters and the plot of the

epic “The Way of Abai”, as well as the features of the writer to identify such unresolved theoretical problems.

**Проблемы теории литературы в казахской литературе**

**Резюме**

В данной статье рассматриваются вопросы теории литературы в исследованиях Р.Бердибая и казахской литературы. От сравнительного анализа сюжета и композиционной структуры, начиная с жанровой и идеологической специфики художественного произведения, он расширяет наше понимание общего внешнего вида и интерьера романа, а также эволюцию работ на историческую тему.

В работах академика Р.Бердибая подробно рассматриваются вопросы поэтика типов, прототипов, пейзажей, портретов и стилей, а также проблемы конфликтов у героев. Автор анализирует сходство персонажей рассказа и романа М.Ауэзова, персонажей и сюжета эпоса «Путь Абая», а также особенности писателя, чтобы выявить такие нерешенные теоретические проблемы.

**Məqalə tarixçəsi**
Göndərilib: 16 yanvar 2020 Qəbul edilib: 21 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/29-34

**Ayşən Əsəd qızı Sadıqlı**
Bakı Dövlət Universiteti

# MİR CƏLAL HEKAYƏLƏRİ ƏDƏBİYYATŞÜNASLIQDA

***Açar sözlər:*** *Mir Cəlal, Azərbaycan ədəbiyyatı, hekayə janrı, ədəbiyyatşünaslıq, görkəmli nasir*
***Key words:*** *Mir Jalal, Azerbaijani literature, history of literature, story genre, literary criticism, distinguished prose-writer*
***Ключевые слова:*** *Мир Джалал, Азербайджанская литература, жанр рассказа, литературоведение, выдающийся прозаик*

Əlli illik yaradıcılıq fəaliyyətində görkəmli nasir kimi Azərbaycan ədəbiyyatı tarixində layiqli və şərəfli yer tumuş Mir Cəlal Əli oğlu Paşayev (1908-1978) müasir Azərbaycan hekayəsinin ən yaxşı nümunələrini yaratmışdır. O, hekayə janrının inkişafında və formalaşmasında xüsusi xidmətləri olan sənətkarlarımızdandır. Mir Cəlalın hekayələri həyati problemlər qaldıran, mənəvi-əxlaqi və ictimai-sosial məsələlər əks etdirən oxunaqlı, məzmunlu, tərbiyəvi əsərlərdir. Məqalədə Mir Cəlalın hekayələri ilə bağlı yazılmış əsərlərə, monoqrafiyalara nəzər salınır. O, cümlədən, Y.İsmayılov "Mir Cəlalın yaradıcılığı" (2010), Cəfər Xəndan "Mir Cəlal" (1958), Ramiz Dənizin "Qəlblərdə yaşayan Mir Cəlal" (2008) və s. əsərlərindən bəhs olunur.

Yazıçının hekayələri haqqında keçən əsrdə bir sıra mətbuat səhifələrində ədəbiyyatşünas alimlərin məqalələrində rast gəlirik. Belə ki, M.Rzaquluzadə "Nəsrimizdə kiçik hekayə" (Ədəbiyyat qəzeti, 1939, 24 aprel) sərlövhəli məqaləsində "Gözün aydın" hekayəsindən danışır, Z.Xəlil "Ədəbiyyatımızda ailə və məişət məsələsi" məqaləsində (Ədəbiyyat qəzeti, 1940, 25 oktyabr) "Şəxsi məsələ" hekayəsindəki ailə məsələsinin də təhlilini vermişdir. C.Xəndan "M.Cəlalın hekayələri" (Azərbaycan ədəbiyyatı (sovet dövrü) 1940, s.87-93), M.Arif "Qəzəbli hekayələr" (Ədəbiyyat qəzeti, 1941, 11 dekabr), Ə.Mirəhmədov "Mir Cəlalın yeni hekayələri" (Ədəbiyyat qəzeti, 1943, 13 fevral) məqaləsində yazıçının hekayə yaradıcılığından bəhs edir. Y.Əzimzadə "Həyat hekayələri"ndə (Ədəbiyyat qəzeti, 1946, 3 iyul) eyni adlı hekayəsi haqqında, R.Rza "Uşaq ədəbiyyatının ideya və bədii səviyyəsinin yüksəlişi uğrunda" məqaləsində (Ədəbiyyat qəzeti, 1952, 16 yanvar) "Söyüd kölgəsi" hekayəsindən də yazıb. Q.Xəlilovun "Hekayələr haqqında" məqaləsində (Ədəbiyyat qəzeti, 1954, 10 aprel) "Badam ağacı" hekayəsindən də bəhs olunur. B.Nəbiyevin "Yeni hekayələrimiz haqqında" (Azərbaycan, 1958) məqaləsində Mir Cəlalın məişət mövzusunda yazdığı satirik hekayələrindən, M.Kamranın "Hekayələrimiz haqqında" məqaləsində (Kommunist, 1955, 15 mart) Mir Cəlalın "Ulduz", "Badam ağacları" hekayələrindən danışılır. Ə.Hüseynovun "Mir Cəlalın hekayələri" ("Azərbaycan", 1956, № 2, S.137-149), "Mir Cəlalın hekayələrində satira və yumor" (1957), "Mir Cəlalın Böyük Vətən müharibəsi illərində yazdığı hekayələr" (1960) adlı məqalələrində ədibin hekayələrinə münasibət bildirilmişdir.

Qeyd etmək lazımdır ki, indiyədək bu sətirlərin müəllifinin Mir Cəlal hekayələrinə həsr olunmuş respublikamızda və xaricdə fəaliyyət göstərən bir sıra nüfuzlu elmi jurnallarda məqalələri dərc olunmuşdur (1; 2; 3; 4; 5; 6 və s.).

Professor Nərgiz Paşayevanın qeyd etdiyi kimi: "Bütün varlığı ilə xalqına bağlı olan Mir Cəlalın yaradıcılığında xalqımızın yarıməsrlik tarixinin müxtəlif mərhələlərindəki ictimai-iqtisadi və mənəvi-psixoloji vəziyyəti, taleyi zəngin həyati faktlar, vüsətli bədii təxəyyül hesabına məharətlə təcəssüm etdirilib" (7).

Ədəbiyyatşünas alim Nizami Cəfərovun qeyd etdiyi kimi: "Mir Cəlal yaradıcılığı boyu, özünün dediyi kimi, "kağız korlamamış" bir sənətkar, ədəbi ictimaiyyətin diqqətini cəlb edən tərbiyəçi kimi yaddaşlarda qalıb. O, ədəbiyyatımıza yeni və maraqlı insan surətləri gətirib, yeniliyin köhnəlik üzərindəki qələbəsini məharətlə açıb göstərib. "Xarici naxoşluq", "Yad adam", "Yalan yeriməz" və s. hekayələrində daha çox mənfilik, köhnəliyin təzahürləri, özündən razılıq kimi hallar kəskin tənqid edilib (8).

Görkəmli ədəbiyyatşünas Cəfər Xəndan 1958-ci ildə "Mir Cəlal" adlı əsərini böyük ədibin anadan olmasının 50 illiyinə həsr etmişdir (9). Ədəbiyyatşünas alim yazır: "Mir Cəlalın hekayəçilik yaradıcılığında nəzərə çarpan fərəhli cəhətlərdən biri də onun bu janr sahəsində ardıcıl fəaliyyət göstərməsidir. Biz bunu nə üçün xüsusi bir məziyyət kimi qeyd edirik? Çünki oxucularımızın illər boyu sevə-sevə oxuduqları və yeni-yeni nümunələrinə ehtiyac hiss etdikləri kiçik hekayə janrı, bir çox görkəmli nasirlərimizin, demək olar ki, hamısı tərəfindən "unudulmuşdur". Onlar cildlərə sığmayan romanlar üzərində on illərlə işləyir, hekayəyə əhəmiyyət vermirlər. Məhz buna görə də bu janrı unutmayan, yeni-yeni hekayələr, novellalar yazan Mir Cəlalın əməyini biz qiymətləndirməyə bilmərik" (10, 22).

Ədəbiyyatşünas Yaqub İsmayılovun "Mir Cəlal yaradıcılığı" əsəri müəllifin 1975-ci ildə çap olunmuş "Mir Cəlal yaradıcılığı" monoqrafiyası əsasında işlənmiş, təkmilləşdirilmiş və nəşr olunmuşdur (11). Professor Ş.Alışanlının elmi redaktoru olduğu bu əsərdə XX əsr Azərbaycan ədəbiyyatının ləyaqətli bir təmsilçisi, ədəbi-ictimai və elmi fikrin görkəmli nümayəndəsi, mahir pedaqoq, istedadlı nəzəriyyəçi, tədqiqatçı və ədəbiyyatşünas alim-Mir Cəlal haqqında yazılmış sanballı əsərlərdən biridir. Əsərdə Mir Cəlalın mahir hekayə ustası kimi, eyni zamanda kiçik bədii formada böyük müvəffəqiyyət qazanmaq, yığcam süjet çərçivəsində dərin ümumiləşdirici fikir ifadə etmək bacarığı qeyd olunmuşdur.

Ramiz Dəniz ədibə həsr etdiyi "Qəlblərdə yaşayan Mir Cəlal" (2008) kitabında yazır: "Mir Cəlal müəllimin hekayələrinin mövzusu rəngarəng, əhatə dairəsi genişdir. Yazıçı kiçik hekayəni öz yaradıcılığında ancaq müəyyən zamanla bağlı, təsadüfi bir janr hesab etməmiş, bəlkə onunla uzun zaman, müntəzəm şəkildə məşğul olmuşdur. Bu cəhətdən o, özünün müasiri olan hekayəçilərdən seçilmişdir. Görkəmli yazar klassik Azərbaycan nəsrinin ən gözəl ənənələrini davam etdirmiş, onun inkişafına və yeni keyfiyyətlərlə zənginləşməsinə çalışmış, ədəbi-tənqidi məqalələrində bu ənənələri təbliğ etmişdir" (12, 56).

Daha sonra müəllif qeyd edir ki, "Mir Cəlal müəllimin ümumən bədii nəsri, xüsusən hekayələri ədəbi ictimaiyyətimizin, geniş oxucu kütləsinin nəzərini cəlb etmişdir (13, 61). Yaradıcı pafosu etibarilə əsasən həyati əsərlər yazmış Mir Cəlal müəllim müəyyən mənada Sabir yaradıcılığının ecazkar təsir orbitinə düşmüş, lirik-romantik əsərlərlə yanaşı, satirik hekayələr də qələmə almışdır" (14, 92).

2008-ci ildə görkəmli ədibin yubileyinə həsr olunmuş "Azərbaycandan hekayələr" adlı kitab almandilli məkanda nüfuzlu nəşriyyatlardan sayılan "Amalthea" nəşriyyatında işıq üzü görmüşdür. Görkəmli yazıçı, ədəbiyyatşünas alim və pedaqoq Mir Cəlalın hekayələri ilk dəfə alman dilində kitab şəklində çapdan çıxmışdır. Müasir Azərbaycan ədəbiyyatının bünövrəsini qoyan tanınmış ədiblər nəslinə mənsub Mir Cəlal çoxcəhətli insan olduğu kimi, əsərləri də öz rəngarəngliyi- janr müxtəlifliyi, mövzu zənginliyi, ana dilimizin lüğət tərkibindən məharətlə istifadə bacarığı, bir sözlə, geniş üslub və bədii forma imkanları ilə seçilir.

Görkəmli nasirin qızı, ədəbiyyatşünas alim Ədibə Paşayeva, avstriyalı azərbaycanşünas xanım Liliane Qrimm və AZƏRTAC-ın Avstriyadakı xüsusi müxbirinin birgə səyi nəticəsində ərsəyə gəlmiş "Azərbaycandan hekayələr" kitabında Mir Cəlalın yaradıcılığının müxtəlif dövrlərini əhatə edən incə yumor və kəskin satira, eləcə də dərin lirik hisslərlə yazılmış hekayələri toplanmışdır. Satirik hekayələrində ustad sənətkar yumor pərdəsi altında həssas oxucuya tipik obrazların timsalında ötən əsrdə Azərbaycanda hökm sürən sovet bürokratiyasını təqdim edir. Lirik notlarla qələmə alınmış hekayələrdə isə XX əsr zəhmətkeş Azərbaycan insanı, cəmiyyəti və dövrün aktual mövzuları bədii cizgilərlə təsvir olunur. Yazıçının bugünkü Avropa oxucusunun bədii zövqünə uyğun gələn, XX əsrdə Azərbaycan həyatının canlı mənzərəsini yaradan və yüksək bədii keyfiyyətə malik çoxsaylı hekayələrindən seçmə əsərlər kitaba daxil edilmişdir (15).

Qeyd etmək lazımdır ki, müasir ədəbiyyatşünaslıq elmi Mir Cəlal hekayələrinin təbiiliyini ona görə yüksək qiymətləndirir ki, bu əsərlərdə insan əməllərinin daxili və zahiri görüntüləri aşkar edilir, insanın və cəmiyyətin həyat fəaliyyətinin əsasını təşkil edən qanunlara münasibət bildirilir, insanlara öz keçmişini qiymətləndirməyə, müasir günlərə nəzər salmağa imkan verir.

Tədqiqatlar göstərir ki, Mir Cəlal müəllimin nəşr olunmayan 11 hekayəsi var. "Yanşaq", "Zirəklik", "Ölü soyan", "Qayğı", "Ulduz kəndinin şəfəqləri", "Tərpənir", "Söylənməyən nitq", "Sorağın gəlsin", "Oturaqlar", "Xallı muncuq", "Sünbül" hekayələri nəşr olunmayıb. Mənbənin verdiyi məlumata görə Mir Cəlal müəllimin tələbəsi və araşdırıcısı professor Təhsin Mütəllimov da bu hekayələrin çap olunmadığını qeyd etmişdir (16).

Salman Mümtaz adına Azərbaycan Dövlət Ədəbiyyat və İncəsənət Arxivində tədqiqatlarımızı davam etdirərkən məlum oldu ki, Mir Cəlal müəllimin çap olunmamış, əski əlifbada, həm də əlyazma şəklində hekayələri də vardır. Arxiv sənədlərindən öyrəndiyimiz məlumata görə Mir Cəlal müəllimin nəşr olunmayan 28 hekayəsi var. Həmin hekayələr bunlardır: "Zuqulba havaları", "Yanşaq", "Zirəklik", "Ölü soyan", "Qayğı", "Ulduz kəndinin şəfəqləri", "Oturaqlar", "Yenilik hissi", "Xallı muncuq", "Roman evləri gəzir", "Sünbül", "Göydən gələn adam", "Bağbanın hekayəsi", "Say və sayaq", "Saxla", "Məhəbbətin gücü", "Quzu", "Kəmtərovun dəstgahı", "Nisgil", "Qız qəlbi", "Albom", "Bacı qardaş", "Sədaqət", "Tərpənir", "Söylənməyən nitq", "Sorağın gəlsin", "Sanbal", "Narkom oğlu".(17) Mir Cəlalın indiyədək çap olunmuş və əlyazması şəklində olan hekayələri haqqında tərtib etdiyimiz cədvəldən öyrənmək olar:

**MİR CƏLAL HEKAYƏLƏRİNİN XRONOLOGİYASI**

| 1930 | 1931 | 1932 | 1933 | 1934 | 1935 | 1936 | 1937 | 1938 | 1939 |
|---|---|---|---|---|---|---|---|---|---|
| 1.Mirzə<br>2.Həkim Cinayətov<br>3.Hacının xəyalı | 4.İlk günlər<br>5.Səfər<br>6.Badamın ləzzəti | 7.Myaxqiy<br>8.İstifadə | 9.Mərkəz adamı<br>10.Qaymaq<br>11.Sara | 12.Təzə toyun nəzakət qaydaları<br>13."Kim"in andı<br>14.Letun<br>15.Göz<br>16.Matışgə<br>17.Kartoşka məsələsi | 18.Bostan<br>19.Sınaq günü | 20.Dostumun qonaqlığı (təsadüf)<br>21.Ayaz<br>22.Yanlış barmaqlar<br>23.Pərzad | 24.Kağızlar aləmi<br>25.Kərpic məsələsi<br>26.Nanənin hünəri<br>27.Gözün aydın<br>28.Hikmətdən xəbər<br>29.Anket Anketov<br>30.Söyüd kölgəsi | 31.İgid oğlan<br>32.Vətən oğlu<br>33.Hilal dayı<br>34.Dost görüşü<br>35.Vicdan əzabı<br>36.Müalicə | 37.Möhlətovun tərcümeyi-halı<br>38.Kimya tələsir<br>39.Mənim parlamentim<br>40.Kəmtərovlar ailəsi |

| 1940 | 1941 | 1942 | 1943 | 1944 | 1945 | 1946 | 1947 | 1948 | 1949 |
|---|---|---|---|---|---|---|---|---|---|
| 41.Qonaqpərəst<br>42.Qəmbərqulu<br>43.Əməli saleh<br>44.Şəxsi məsələ<br>45.Mərifət dərsi<br>46.Tamaşa<br>47.İlhamın anası<br>48.Anaların üsyanı<br>49.Ananın köynəyi<br>50.Gülgəz<br>51.Məşriq | 52.Boz adam<br>53.Fitnə<br>54.Ata<br>55.Qardaş qanı<br>56.Qorxu<br>57.Susuzluq<br>58.Vuran əllər<br>59.Yol açıqdır<br>60.Yollar<br>61.Şahin və Sona<br>62.Şərbət | 63.Ananın yarışı<br>64.Havalı adam<br>65.Mərcan nənə<br>66.Ana<br>67.Arxa əsgəri<br>68.Atlı<br>69.Baldan əvvəl<br>70.Çupçik<br>71.Çəkmə<br>72.Göylər adamı<br>73.Odlu mahnılar<br>74.Ölümdən betər | 75.Axşam səfəri<br>76.Vətən yaraları<br>77.Xəbər ətərsiz<br>78.Leyla<br>79.Muştuluq | 80.Titrək bir səs<br>81.Ər və arvad<br>82.Barxudar<br>83.Çıraqlar yandı<br>84.Dissertasiya | 85.Ailə<br>86.Həpəndovun məqaləsi<br>87.İki ananın bir oğlu<br>88.Oğul<br>89.Millətin "müalicəsi"<br>90.İki səs<br>91.Qələmdan<br>92.Silah qardaşları<br>93.Mənim də haqqım var<br>94.Salam<br>95.Gözətçi<br>96.Aqil | 97.İmtahan | 98.İki rəssam | 99.İftixar<br>100.İlk vəsiqə | 101.Gənc usta |

| 1950 | 1951 | 1953 | 1954 | 1955 | 1956 | 1957 | 1958 | 1959 | 1960 |
|---|---|---|---|---|---|---|---|---|---|
| 102.Yaradan əllər<br>103.Çin qızı | 104.Gilasın sevinci | 105.Əsgər oğlu<br>106.Mərdimazar<br>107.Qələm<br>108.Əskinasın tarixi<br>109.Badam ağacları | 110.Buz maşını<br>111.Gərək olar<br>112.İclas qurusu<br>113.Özgə uşağı<br>114.Özündən naxoş<br>115.Ulduz<br>116.Yuxu və külək<br>117.Anamın qeydləri<br>118.İki fermer<br>119.Hesab dostları | 120.Plovdan sonra<br>121.Qotazlı çəkmə | 122.Elçilər qayıtdı<br>123.Oğul anası<br>124.Subaylıq fəlsəfəsi<br>125.Qanlı torpaq | 126.Döyüşçünün dedikləri<br>127.İtpərəstlərin həyəcanı | 128.Hava bürosu<br>129.Lirika<br>130.Əl xətti<br>131.İki hakim<br>132.Nazik mətləb<br>133.Mən də bakılıyam<br>134.Ərəb qızı<br>135.Naxış | 136.İnsanlıq fəlsəfəsi<br>137.Ürəkdə yazı<br>138.Xəcalət<br>139.Sancaq fabrikində | 140.İlk hədiyyə<br>141.Qocaların uşaq söhbəti<br>142.Qəbul imtahanı<br>143.Neçə cür salam var?<br>144.O dünyada<br>145.Pioner maşını<br>146.Tövbələtmə<br>147.Vicdan mühakiməsi<br>148.Dağların qəlbi<br>149.Zəhmət, ağıl, bəxt<br>150.Havapərəstlər<br>151.Kəhərin son günləri<br>152.Gözəl barəsində<br>153.Gənc şairin ərizəsi<br>154.Xarici naxoşluq<br>155.Ərəb qardaş<br>156.Ləyaqət<br>157.Ömrün mənası<br>158.Səyyah xanım<br>159.Ərik ağacı |

| 1961 | 1962 | 1963 | 1964 | 1965 | 1966 | 1967 | 1968 | 1969 | 1970 |
|---|---|---|---|---|---|---|---|---|---|
| 160.Gülbəsləyən qız<br>161.Ehtiram<br>162.Mən zaminəm<br>163.Mənim vəfalı dostum<br>164.Şapalaq<br>165.Dil və əməl<br>166.Mənim “səmimi dostum”<br>167.Rola girib<br>168.Sözün yeri var | 169.Heykəl uçulanda<br>170.İki qız, bir oğlan<br>171.Yad adam<br>172.Telefon dostum<br>173.Radio qabağında<br>174.El xadimləri<br>175.Müdafiə vəkili<br>176.O yana baxan<br>177.Pillələr | 178.Məni görmürsünüz?<br>179.Bacı-qardaş<br>180.Az danışmağın faydası<br>181.Mənim dilmancım<br>182.Düz adam<br>183.Öyrəncəkli<br>184.Paho, paho-o... Vay!<br>185.“İngilis” dili<br>186.Ədəb söhbəti<br>187.Xəzinədar<br>188.Maşında<br>189.Ay İsmayıl, başa sal<br>190.Məhəbbət, yaxud qəlp pul | 191.Mən də bir elçi kimi<br>192.Turşuqeyrət<br>193.İmzasız hekayə<br>194.Niyə ovdan ayaq çəkdim<br>195.Mən deyən<br>196.Mən necə həkimlik öyrəndim<br>197.Qulluqçu haqqında<br>198.Şirin söhbət<br>199.Ana məsləhəti<br>200.Düşünmək istəyirəm<br>201.Gör fələk nə sayır<br>202.Biri var idi, ikisi yox<br>203.Xoşbəxtlik barəsində<br>204.Hərənin öz işi var<br>205.Şərait yoxdur<br>206.Yaylaq məsələsi | 207.Müsəlman və texniki tərəqqi<br>208.Əmzik<br>209.Yamanlığa yaxşılıq<br>210.Mənim utancaq tələbəm<br>211.Qanadlı qızlar | 212.Ad günü<br>213.Fərəh məclisi<br>214.Liman oğlu | 215.Abadlıq<br>216.Yaratmaq sevinci<br>217.Bağa getmişdim<br>218.Bizim quşlar<br>219.Bizim mühəndis<br>220.İki filosof<br>221.Daha bir yadigar | 222.Məsul işçinin dəftərindən<br>223.Səadət sarayları<br>224.Ürəkdən danışaq<br>225.Babam kərpic kəsəndə<br>226.Şaftalı söhbəti | 227.Beş almışam!<br>228.Düzəlmədi<br>229.Pul tapmışdım<br>230.Xatalı adam<br>231.Sevinc haqqında<br>232.Şəfəqdən qalxanlar<br>233.Mühazirəçi yoldaşım<br>234.Qoltuq radiosu<br>235.Yaxşı nədir, pis nədir<br>236.Mərd və namərd<br>237.Xallı xanım | 238.Ad axtaranlar<br>239.“Xanım qələmi”<br>240.Nəzakət<br>241.Gülzar haqqında |

**Ədəbiyyat**

1. Sadıqlı A.Ə. Mir Cəlal qüdrətli yazıçı, dəyərli alim-pedaqoq, görkəmli ədəbiyyatşünasdır //Mir Cəlal görkəmli yazıçı və ədəbiyyatşünas kimi (məqalələr toplusu) B.: Elm və təhsil, 2013,s.92-97.
2. Sadıqlı A.Ə. Mir Cəlal hekayələrində ailə-məişət məsələləri // Gənclərin Elmi Araşdırmalarına dəstək İctimai Birliyi. Bakı, 2016,s. 53-58.
3. Садыглы А.А. Художественное отражение психологии человека в рассказах Мир Джалала / Казахский Национальный Педагогический Университет имени Абая // Вестник: Серия «Филологические науки», Алматы, 2017, №4(62),с.191-197.
4. Sadıqlı A.Ə. Mir Cəlal hekayələrində sosial-mədəni problemlərin əksi (Yazıçının həkimlərə həsr edilmiş hekayələri əsasında) // AMEA Axtarışlar: (folklor, ədəbiyyat, dil, sənətşünaslıq və tarix) Naxçıvan bölməsi, İncəsənət, dil və ədəbiyyat İnstitutu. Naxçıvan, 2018,C.8, №2(28), S.40-45.
5. Sadıqlı A.Ə. Mir Cəlal hekayələrində mənəvi-əxlaqi problemlərin ideya-bədii əksi // Bakı Slavyan Universiteti, Dil və ədəbiyyat, 2018, s.164-168.
6. Садыглы А.А. Идейно-художественное отражение сатиры и юмора в рассказах Мир Джалала // Eurasia Science. Сборник статей XXIII международной наусно-практической конференции. Москва: «Научно-издательский центр «Актуальность. РФ», 2019, с.138-139.
7. http://www.anl.az/down/meqale/medeniyyet/2014/may/367263.htm
8. Yenə orada
9. Xəndan Cəfər. Mir Cəlal .Bakı,1958, 50 s.
10. Yenə orada, s.22
11. İsmayılov Y.M. Mir Cəlalın yaradıcılığı: monoqrafiya /Y.M.İsmayılov; elmi red. Ş.H. Alışanlı; AMEA Nizami adına Ədəbiyyat İnstitutu.- Bakı: Elm, 2010, 292 s.
12. Dəniz Ramiz. Qəlblərdə yaşayan Mir Cəlal / R. Dəniz; red. Ç.Abdullayev.- Bakı: Yurd NPB, 2008, 159 s.
13. Yenə orada, s.61
14. Yenə orada, s.92
15.https://azertag.az/xeber/Gorkamli_adib_mir_calalin_hekayalar_kitabi_alman_dilinda_isiq_uzu_gormusdur-423672
16. https://525.az/site/?name=xeber&news_id=75583#gsc.tab=0
17. Sadıqlı A.Ə. Mir Cəlalın çap olunmamış hekayələri // Dil və ədəbiyyat: Beynəlxalq elmi-nəzəri jurnal, №4 (112), Bakı, 2019, S.130-134).

**Mir Jalal's stories in literary criticism**

**Summary**

The distinguished prose-writer Mir Jalal who has borrowed worthy and honor place in the Azerbaijani literature during fifty years' creative activity has created the best samples of the modern Azerbaijani story. He is one of our writers which has big merits in development and formation of the story genre. The Mir Jalal's stories legible, substantial, educational works which lift vital problems spiritual and moral and public social problems. In article a subject Mir Jalal's stories in literary criticism has been taken as a research object. Works, monographs which have been written about Mir Jalal's stories are considered. Including, the attention to the works Y.Ismailov "Creativity of Mir Jalal" (2010), Jafar Handan "Mir Jalal" (1958), Ramiz Deniz "Mir Jalal living in hearts" (2008), and etc. has been paid.

**Рассказы Мир Джалала в литературоведении**

**Резюме**

Выдающийся прозаик Мир Джалал, занявший достойное и почетное место в азербайджанской литературе в течении пяти десятилетней творческой деятельности создал самые лучшие образцы современного азербайджанского рассказа. Он – один из писателей, сыгравших важную роль в развитии и формировании жанра рассказа. Рассказы Мир Джалала удобочитаемые, содержательные, воспитательные произведения, которые поднимают жизненные проблемы, отражают духовно-нравственные и общественно-социальные вопросы. В статье рассматриваются научные работы, монографии, которые были написаны о рассказах Мир Джалала. В том числе, было обращено внимание на работы Й.Исмаилова «Творчество Мир Джалала» (2010), Джафар Хандана «Мир Джалал» (1958), Рамиз Дениза «Мир Джалал, живущий в сердцах» (2008) и др.

**Rəyçi: prof. A.Abasov**

**Məqalə tarixçəsi**
Göndərilib: 26 yanvar 2020 Qəbul edilib: 28 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/35-37

**Лятафет Яшаровна Зейналлы**
Бакинский славянский университет

# ХУЛИО КОРТАСАР – ЖЕМЧУЖИНА ЛАТИНОАМЕРИКАНСКОЙ ЛИТЕРАТУРЫ

То, что осталось было создано в одиночестве и отвоёвано у тьмы.

***Ключевые слова:*** *латиноамериканская литература, Кортасарский герой, игра*
***Açar sözlər:*** *Latın Amerikası ədəbiyyatı, Kortasar qəhrəmanı, oyun*
***Key words:*** *Latin American literature, Cortazarian hero, playful maner*

Развитие латиноамериканской литературы имело свой, субъективный, опыт. Она не могла полностью развиваться ни на основе фольклора индейцев в силу языкового барьера, ни на основе испанской литературы – в силу отличий отраженной в ней действительности и испанского сознания. Однако, латиноамериканская литература формировалась, используя опыт как испанской, так и других европейских литератур, переиначивая этот опыт, вырабатывая собственный стиль и язык. Инверсия, парафраз, интерпретация европейской традиции являют собой основу латиноамериканской литературы. Более того, влияние латиноамериканской культуры на испанскую было отмечено в Кэмбриджской истории испанской литературы: «В то же время влияние латиноамериканского романа, которое возросло в 1960-х, всё ещё было очень сильным. Без этого влияния, прямого или непрямого, нелегко объяснить успех таких работ как, «Сага-полёт Х.Б.», 1972, Гонзало Торредо Бальэстера и «Глаз кошки Агаты», 1974, Хосе Мануэля Кабальэро Боналда» [1, p. 691].

Строки эпиграфа относятся к творчеству одной из ярчайших фигур латиноамериканской литературы - аргентинскому писателю Хулио Кортасару (1914-1984), который ещё при жизни снискал мировую славу. Писатель умело создавал большое количество рассказов, романов, пьес, выпускал сборники стихотворений, а также писал очерки и эсс и занимался переводами. Значимость писателя, в первую очередь, обоснована сочетанием в его творчестве, как латиноамериканских тематических наследий, так и глубокого понимания и выражения в текстах западноевропейской культуры. Его жизнь и творчество подразделяются на два этапа: до и после переезда писателя из Аргентины в Париж. Доевропейский период охватывает сборник рассказов «Bestiario» («Бестиарий», 1951) и пьесу «Los Reyes» («Цари», 1949). Несколько ранних произведений Кортасара были опубликованы после его смерти («La orilla otra» («Другой берег», 1937–1945), «Divertimento» («Дивертисмент», 1949) и «El examen» («Экзамен», 1950). Значительную часть своей жизни Х.Кортасар провел в Европе, где и написал свои наиболее выдающиеся произведения: романы «Rayuela» («Игра в классики», 1963), «62 / Modelo para armar» («62. Модель для сборки», 1968), «Historias de cronopios y de famas» («Истории хронопов и фамов», 1962), сборник рассказов «Todos los fuegos el fuego» («Все огни – огонь», 1966). Интересно отметить, что писатель начинал свой путь как поэт. Его дебют состоялся сборником стихотворений «Presencia» («Присутствие»). На протяжении всей жизни он сочинял стихи, однако не публиковал их. Весьма значимый сборник «Salvo el crepúsculo» («Только сумерки») был издан посмертно:

*Боги ступают по нашей земле, брезгливо*
*приподнимая края своих одеяний.*
*Среди гниющих кошачьих трупов, среди раздавленных червей*
*они проходят в сандалиях,*
*сырых от плевков времени.*

Профессор-литературовед Александр Колман отмечает, что в 50-60-е годы латиноамериканская литература была полна второсортными произведениями, а чилийский писатель Хосе Доносо подчёркивает национально-бытовую замкнутость характерную для того времени. Тем самым, взаимное влияние европейской литературы на латиноамериканскую, и, наоборот, было сильно ограничено. Публикация романа Х.Кортасара «Игра в классики» в 1963 году стала настоящим событием в истории испаноязычного романа. В тоже время, ряд представителей, так называемого, магического реализма и нового типа латиноамериканского романа был представлен миру: Хосе Доносо, Хуан Карлос Онетти, Габриэль Гарсиа Маркес, Мигель Анхэль Астуриас, Хорхе Луис Борхес.

Произведения Кортасара открыли миру новый взгляд на Латинскую Америку, тем самым оказав огромное влияние на сознание людей не только испаноговорящего мира. Наиболее традиционными мотивами его творчества являются магический реализм и проявления фантастической, мифологиче-

ской составляющей текстов и эстетика игры. Переплетение фантастики с реальностью придаёт особую привлекательность произведениям. Тексты Кортасара насыщены отсылками к различным областям культуры, отмечены высоким интеллектуализмом и призывом к читателю - быть соавтором. Метафоры, поэтические образы и ассоциации приближают его творчество к постмодернизму. Его произведения - это продукт, который рассчитан на всячески подкованного читателя, который будет активно вовлечён в творчество. Кроме того, писатель затрагивает большое количество философских проблем-гносеологических, антропологических и онтологических. У Кортасара широкий круг тем, который охватывает многие аспекты жизни, ведь его герои в вечном поиске смысла жизни, в попытках осознать себя и окружающий мир-это актуально всегда, для людей любого возраста. К примеру, в ироничных рассказах «Истории о хронопах и фамах» обращается внимание на алогичные условности человеческой жизни; а в рассказах сборника «Все огни – огонь» представлены схожие ситуации, происходящие в различных странах и в различные эпохи. Основу рассказа «Слюни дьявола» составляют бесконечные путешествия героя в свою душу, провалы в видимое и невидимое и метафорические превращения фотографий.

В статье Л.Осповата «Поиски и открытия Хулио Кортасара» подробным образом анализируется творчество писателя, представленного вечным искателем, который отказывается признавать этот мир в его текущем состоянии-Кортасар в постоянном развитии, изменении, текучести. Это внутреннее «я» писателя проявляется во многих его персонажах, в частности, из произведений «Выигрыши», «Слюни дьявола», «Преследователь» - все герои делают попытку проникнуть за грань лжи, лицемерия и пошлости чтобы достичь истины и «постичь сокровенную суть бытия и сделать её внятной для всех людей». Образ Кортасара выходит за рамки однобокого рассмотрения-это ведь человек, борющийся против несправедливости.

Ещё одна черта творчества Кортасара проявляется в довольно ироничном отношении к миру, в пародировании традиционных ценностей и сведении их к абсурду. Он критикует обыденность, которая цепляясь за устаревшие и архаичные рамки минувших дней, отказывается принимать мир в постоянном его движении. Писатель стремится не только сочинить произведение, но и видоизменить мир, добавляя новые элементы-тем самым обыгрывая его в игровой форме. Его мир сочетает в себе как черты реальности, так и фантастики, которая, тем не менее, воспринимается как нечто естественное и заставляет человека поверить в эту реальность. Следует также упомянуть гуманистический посыл творчества Кортасара, для которого свобода была одним из основных пластов жизни - свобода, как прав человека, так и свобода творчества. Таким образом, писатель всегда обращал внимание читателей на острые проблемы общества. В одном из своих эссе, которое посвящено Лорке он пишет: «для того, чтобы другие поэты не были убиты, для того, чтобы человек отыскал, наконец, своё подлинное лицо, - только для этого стоит сражаться во имя света, во имя поэзии, звучащей на улицах и в мироздании, во имя любви».

Для героев Кортасара характерно отрицание рамок, отказ от идеологий, игривое отношение к жизни и презрение к устаревшим правилам и нормам. Они не привязаны к определённому месту или стране - они люди разных национальностей, позиций и взглядов. Объединяет их одно - большое количество вопросов к миру, который полон неправды и абсурда. Эти герои представляют собой группы людей, которые близки по духу и образу мыслей. Само их существование и повседневная жизнь опровергает миропорядок, в котором царствуют условности и стандарты. Кортасаровский герой не желает примириться с окружающим миром, он остро чувствует абсурдность современного мира с его непрекращающимися войнами и конфликтами, и он, герой, пытается, эту абсурдность воплотить, показать её нелепость и жестокость. В рассказе «Апокалипсис в Солентинаме» герой видит ужасные фотографии уличных беспорядков в Латинской Америке, он их не снимал, но «запечатлел, как все мы, своим сознанием, своей совестью, своей ненавистью к миру насилия и произвола».

Несмотря на переезд во Францию, Кортасар не раз переносит действие своих произведений в Аргентину, а также щедро приправляет их разноязычными персонажами. Тем самым, красной нитью через его творчество проходит связь с Аргентиной, тоска по ней и своеобразный трагизм в желании соединиться с нею. «…Словно Орфей, я столько раз оглядывался назад и расплачивался за это. Я и поныне расплачиваюсь; и всё смотрю и буду смотреть на тебя, Эвридика-Аргентина».

В предисловии к сборнику «Аргентинские рассказы» В.Земсков заявляет: «Писателем, который лишил модернистскую литературу привилегии на интеллектуализм и фантастику, стал Хулио Кортасар, в творчестве которого, вновь пересеклись тропинки аргентинской прозы. Не случайно ведь в аргентинской критике прочно утвердились понятия: ‘до Кортасара’ и ‘после Кортасара’». Тем самым, Кортасар в своём творчестве коснулся очень важных социальных, психологических, нравственных

проблем, вопросов свободы и долга; более того, вдохнув в свои произведения игровой дух и большое количество аллюзий, стал центральной фигурой латиноамериканской литературы. Он прочно занял там место писателя, который часто обращается к различным художественным приёмам, чьи тексты обладают метафоричностью, высокоинтеллектуальностью и большим мастерством, представляя большой интерес для исследований.

**Литература**

1. The Cambridge History of Spanish Literature. Edited by David T. Gies. Cambridge, 2008.
2. Аргентинские рассказы / Пер. с исп., сост. Э. Брагинской, предисл. В. Земскова. М.: Худож. лит., 1981. 286 с. С. 13.
3. Брагинская Э. Хулио Кортасар и его рассказы // Кортасар Х. Другое небо. М., 1971. С. 9.
4. Кортасар Х. Выигрыши: Роман. Повести и рассказы. М.: Прогресс, 1976. 462 с.
5. Кофман А.В. Латиноамериканский художественный образ мира. М.: Наука, 1997, 320 с.
6. Кутейщикова В.Н. Осповат Л.С. Новый латиноамериканский роман. М.: Сов. писатель, 1976. 385 с.
7. Мамонтов С. П. Испаноязычная литература стран Латинской Америки. М.: Высшая школа, 1964. 278 с.
8. Осповат Л. Поиски и открытия Хулио Кортасара//Выигрыши М.: Прогресс, 1976, с. 13

**Электронные ресурсы**

Произведения Хулио Кортасара:
1. https://www.e-reading.life/bookbyauthor.php?author=8436
2. http://www.uic.unn.ru/~riana/library/cortasar/twilight/content.htm

**Xulio Kortasar – Latın Amerikası ədəbiyyatının incisi**

**Xülasə**

Məqalə argentinalı yazıçı Xulio Kortasarın yaradıcılığının qısa icmalına həsr olunub. Reallığın fantastika ilə heyrətamiz vəhdəti, verilmə tərzinin və intellektuallığın oynaması – onun əsərlərinin əsas cəhətləridir. Onun əsərlərini dərk etmək üçün intellektual cəhətdən bilikli oxucu olmaq lazımdır, çünki onun işləri mürəkkəbdir və müxtəlif dərketmə tələb edir. Kortasarı novatorluq və eksperimentlərə əbədi meyli xarakterizə edir. Avropada çoxlu əsərlər yaratsa da, o, vətən həsrətini bütün ömrü boyu urəyində daşıyıb, və Argentina mədəniyyətini, oranın dil xüsusiyyətlərini öz yaradıcılığına uğurla əks etdirib. Yazıçı geniş mövzuları əhatə edir. O, nəsr ustası olmaqla yanaşı, gözəl şeirlər də yaradırdı. Bundan başqa, Kortasar ətraf gerçəkliyə aid fəlsəfi məsələlərə də toxunurdu. Onun yaratdığı obrazlar özünəməxsusdur və sərbəstdir – onlar daim ədalətsizliklə və ənənələrə həddindən artıq sadiqliyə qarşı mübarizə aparırlar. Yazıçının yaradıcılığı çoxşaxəlidir və ispandilli ədəbiyyatında xüsusi yer tutur.

**Julio Cortasar - a pearl of Latin American literature**

**Summary**

The article is devoted to a brief review of the work of the Argentinian writer Julio Cortazar. The striking combination of reality with fiction, playful manner of presentation and intellectuality are the main features of his works. In order to understand his works, one must be an intellectually savvy reader, since his works are complex and require various kinds of knowledge. Cortazar describes the eternal quest for innovation and experimentation. Despite the fact that a large number of works were created in Europe, homesickness he carried through his life, successfully weaving features of Argentinian culture and language in his creations. The writer covers a wide range of topics. Being a master of prose, he also created great poems. In addition, Cortazar touched phylosophical issues relating to the surrounding reality. The images created by him are original and independent-they are in constant struggle with injustice and excessive adherence to traditions. The writer's work is multifaceted and is key in Hispanic literature.

**Рецензент: проф. Дж.Нагиев**

**Məqalə tarixçəsi**
Göndərilib: 25 yanvar 2020 Qəbul edilib: 28 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/38-42

**Sevinc Ağadin qızı Bağırova**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)

# A.S.PUŞKİNİN "PEYĞƏMBƏR" ŞEİRİNDƏ İSLAM MOTİVLƏRİ

***Açar sözlər:*** *A.S.Puşkin, "Peygəmbər" şeiri, Şərq motivləri, islam motivləri, Şərq-Qərb*
***Key words:*** *AS Pushkin, "The Prophet" Poetry, Oriental Motives, Islamic Motives, East-West*
***Ключевые слова:*** *А.С.Пушкин, стихотворение «Пророк», восточные мотивы, исламские мотивы, Восток-Запад*

Rus romantik oriyentalizminin nümunələri rus ədəbiyyatın klassik prinsiplərini qorumaqla Şərq-Qərb mental sistemlərinin sintezini ifadə edir. Şərq motivləri ilə aşılanmış belə mətnlərin təhlili, bir tərəfdən, rus oriyental romantizminin səciyyəvi tipoloji xüsusiyyətlərini, digər tərəfdən isə müsəlman mentallığının bütövlükdə rus ədəbiyyatına təsirini öyrənməyə imkan verir. Rus oriyental romantizminin ən dəyərli nümunələri, fikrimizcə, "Şərq-Qərb sintezi"nin ən parlaq nümunələridir. Bu isə, yalnız iki poetik ənənənin çulğaşmasını deyil, həm də mahiyyətcə qovuşnasını ehtiva edir. Tədqiqatçı Y.M.Vereşaginanın fikrincə, bu hadisə "müəyyən milli mədəniyyətdə yetişmiş insanın digər mədəniyyətin fakt, dəyər və normalarının bir hissəsini əxz etməsindən" ibarətdir. [1, s.11]. Lakin, Şərq-Qərb sintezi iki mədəni-mənəvi ənənənin eyniləşməsi anlamına da gəlmir. Yəqin ki, bu A.S.Puşkin, M.Y.Lermontov, N.Qumilyov, İ.Bunin və digər müəlliflərin oriyental əsərlərində fərqli ideyaların və rəmzlərin bir mətndə birləşməsindən söhbət gedə bilər. Tədqiqatçı Y.E.Proxorova bu tipli əsərlərin təhlili üçün, fikrimizcə, dəyərli ola biləcək çoxpilləli modeli müzakirəyə təqdim edir. O, hesab edir ki, rus romantik şairləri ilkin olaraq Şərq fəlsəfəsinə aid kodları qavrayıblar. Növbəti mərhələ isə bilavasitə Şərq fonuna dalmaqdır. Üçüncü mərhələdə Şərq aləmi ilə yaxından tanışlıq baş verir. Bu, müsəlman mühitini obrazlı şəkildə canlandırmaq, milli ənənə və inanclarla assosiativ əlaqələrdir. Nəhayət, bu üç faza sonuncu mərhələdə "iki mədəniyyət və müvafiq olaraq fərqli mental sistemlərin qarşılıqlı təsirinə yol açır" [2, s.106]. Eyni zamanda, tədqiqatçı birinci, "təmas" fazasında mədəni stereotiplərin tutuşdurulmasından, ədəbi tənqiddə Şərq mədəni reallıqlarının bir qədər sxematik istifadəsinin vurğulanmasından çıxış edir. İkinci mərhələdə müəllif müsəlman mədəniyyətinin əsaslarına yiyələnməyə çalışır. Lakin, bu mərhələdə bilikləri səthi və bəzi hallarda primitiv olur. Eləcə də müəllifin mövzusuna uyğun birtərəflilik də izlənir. Üçüncü, əsas və həlledici mərhələdə romantik ədib müsəlman mədəniyyətinin və islam dininin, Quran mətninin mahiyyətinə dalır. Bu mərhələdə artıq müəllif yeni dəyərlər məcmusunu və rəmzlərin anlamını dərk etməyə başlayır. Nəhayət, sonuncu mərhələdə "qarşılıqlı təsir" baş verir və yeni dəyərlər məcmusunun daxilən əxz olunması və mənimsənilməsi baş verir (F.M.Dostoyevskinin Puşkin haqqında "bu müsəlman deyilmi?" sualını xatırlayaq). Müəlliflər əsərlərində sanki doğma mühitini, özünün də daxil olduğu ortaq mənəvi aləmi təsvir və tərənnüm edir.

Rus ədiblərinin, Qərbdən fərqli olaraq, müsəlman mühitini belə dərindən mənimsəməsi, dediyimiz kimi, rusların Şərq, türk və dağlı müsəlman xalqları ilə sıx tarixi əlaqələri, imperiya tərkibində birgə yaşayışı, eyni zamanda XIX əsr rus yazıçı və şairlərinin dünyagörüşündə romantizmdən irəli gələn asiyaçılıq və humanizm ənənələri ilə izah edilə bilər. Belə istedad və dahiyanə hissiyyat sahiblərindən biri, sözsüz ki, A.S.Puşkin idi. Onun bir sıra oriyental əsərlərində milli, Şərq və eyni zamanda Qərb dəyərləri elə bir ahəngdarlıqla birləşir. Puşkin dühasının bu cür xüsusi səciyyəsi onun yaradıcılığının proteizmi haqqında danışmağa imkan verir. Görkəmli puşkinşünas Y.M.Lotmanın yazdığı kimi, "Puşkin proteizmi, ilk dəfə XIX əsrdə Puşkinin yaradıcılıq nailiyyətlərində müxtəlif mədəniyyətlərin simbiozu cizgilərini qazanmış naməlum güc, enerji və bilik mənbəyinin müti dərki"ndən ibarət ədəbi və estetik hərəkatdır [3, s.211]. A.S.Puşkin öz "Peyğəmbər"i ilə öz yaradıcılığında bu hərəkatın əsasını qoyur. Bu meylin qərarlaşması isə M.Y.Lermontovun yaradıcılığında, xüsusən də, şairin Azərbaycan dastanı motivləri əsasında yazdığı "Aşıq Qərib" türk nağılında baş verir.

A.S.Puşkinin "Peyğəmbər"i haqqında bir çox tədqiqatçılar, o cümlədən Azərbaycan alimləri elmi əsərlər yazmış, fikir söyləmişlər. Müxtəlif fikirləri təkrarlamadan, yuxarıda qeyd etdiyimiz proteizm fenomeni baxımından bu əsərdə Quran motivlərinin mənimsənilərək bədii təfsirini tapdığına diqqəti yönəltməyə çalışacağıq. Başqa sözlə desək, "Peyğəmbər", fikrimizcə, "Qurana təqlidlər" silsiləsinin bir hissəsi olmasa da, XIX əsrin birinci rübü rus romantizmində müsəlman mətni və ezoterizmə vahid yanaşma çərçivəsində araşdırılmalıdır. "Peyğəmbər"in məhz belə təfsiri zərurəti nə ilə bağlıdır? Əsərdəki motivlərin assosiativ müqayisəsi göstərir ki, formal yanaşma ilə, yəni yalnız şeirdə geniş yer tutan kilsə-slavyan leksikasına, müəyyən tarixi həqiqətlərə əsaslanaraq mətnin alt mənasını anlamaq mümkün deyil. Səfər, sərgərdanlıq, yol,

yolayrıcı, ali həqiqətin əyan olması kimi motivləri İncil əsasında təfsir etmək mümkün deyil. Və bu, yalnız bizim müşahidəmiz deyil. Bu haqda Y.P.Çelışeva "Şərq dünyası və A.S.Puşkin" adlı məqaləsində, Səfa Mahmud Əlvavi "A.S.Puşkin və ərəb Şərqi" adlı dissertasiyasının avtoreferatında, D.T.Ataxanova "A.S.Puşkinin yaradıçılığında" adlı dissertasiyasında və bir çox başqa araşdırmalarda rast gəlirik. A.Hacılı şeirdəki "köksün yarılması" motivini (*И он мне грудь рассек мечом, // И сердце трепетное вынул, // И угль, пылающий огнем, // Во грудь отверстую водвинул*) önə çəkərək yazır: "Puşkinin Qurana təqlidlərlə həmahəng olan digər əsəri iki il sonra yazılmış "Peyğəmbər" şeiridir. İncildən İsaya, İeremey və ya İezekil peyğəmbərlər haqqında olduğu güman edilən bu şeirdə, bir çox tədqiqatçıların göstərdiyi kimi, Quranın "Fatir", "Əl-Muddəssir", "Əl-Ələq", "Əl-Qədr" surələrindən istifadə olunmuşdur. Bəzi motivlərin Quran və İncil arasında müştərəkliyi də qeyd olunmalıdır... Puşkinin Peyğəmbərin köksünün yarılması, qəlbinə peyğəmbərlik əlaməti olan saf və alovlu köz-ürək qoyulması haqda qələmə aldığı bu motiv Qurandan (müəllifin qeyd etdiyi kimi, Əl-İnşirah surəsindən – S.B.) təbdil olunub. Ancaq Puşkin bu Quran obrazını həm də Əhdi-Ətiqdəki digər variantla – köz motiviylə (Yeşayanın / İsayanın / Kitabı, 6:7) tamamlayıb. Eyni zamanda bu ayə Puşkin tərəfindən Qurandakı məzmundan əlavə, islam aləmində yayılmış təfsir variantına uyğun – ürəyin təmizlənərək yenidən köksə qoyulması kimi işlənmişdir. Bu cəhət şairin Qurandan başqa digər islam mənbələrinə də bələdliyini göstərir" [4, s.68-69].

Məhz Quran motivləri, bir çox tədqiqatçıların fikrincə, bu şeirin, islam ideologemlərinə əsaslanan daxili tamlığını təmin edir. Şeirdə əhəmiyyətli yer tutan motivlərdən biri – "yol" motivi "yolayrıcı" xronotopu ilə aktuallaşıb. Mifoloji-dini təlimlərdə yolun xüsusi anlam kəsb etdiyi məlumdur. Yol gərgin mənəvi həyat yaşayan, mənəvi kasadlığını ("mənəvi təşnəlik", Puşkində "«духовная жажда»") anlayan insan üçün həyat yoluna, ruhsal yola çevrilir. Bu şeirdəki "təşnəlik" də mənəvi-ruhsal təşnəlikdir. Bu anlayış həm İncil, həm də Quranda izlənən mühüm rəmzlərdəndir. İncildə daha çox "həyat yolu" («жизнь» - «жити» - «житие» святых), Quranda və islam ənənəsində isə "mənəvi yol" anlamı üstünlük təşkil edir. Müsəlman mədəniyyətində "yol" motivi gerçək həyati yoldan daha çox, özünüdərkə, həqiqəti dərkə, haqqa doğru aparan, müxtəlif rəmzi obrazlarla – qərib, dərviş, səyyah, səhra – bağlanan, Allah dərgahına aparan mənəvi yoldur.

Bu anlayışlar Puşkinin haqqında danışdığımız şeirində də mahiyyətcə islami məna kəsb edir, tənha və təşnə insanın kimsəsiz məkanlarda adi sərgərdanlığı deyil, Haqqa doğru gedişi kimi qavranılır. Bu şeirdə məkan olaraq səhra təsadüfi seçilməyib. Səhra burada simvolik şəkildə iki mənanı ifadə edir. Birincisi hər üç din yəhudilk, xristianlıq və islam ilkin olaraq məhz bu məkanda yaranmışdır. İkincisi, səhra insanın cismani yaşayış üçün tam mənfi bir yerdir. Bu cür fiziki və psixoloji iztirablar məkanı olan səhrada insan ali məqam. Və belıliklə, səhra özünüdərk və ilahi mətləblərə, ilahi məqama yaxınlaşmaq üçün müsbət məkan kimi təsvir olunur.

A.S.Puşkin, P.P.Manassein, Y.P.Polonski, N.P.Karbçevski, A.A.Fet, İ.A.Bunin, D.L.Andreyev, A.Platonov, M.M.Prişvin və bir çox başqalarının yaradıcılığında səhra dini-mənəvi axtarışların baş tutduğu, mələklərin dolaşdığı və ilahi həqiqətin peyğəmbərlərə əyan olduğu ecazkar məkan kimi təqdim olunur. Rus ədəbiyyatında bu ənənənin banisi isə A.S.Puşkin olmuşdur. Onun "Qurana təqlidlər" silsiləsində, "Peyğəmbər" şeirində səhra mənəvi təkamülə imkan yaradır, ilahi qüvvələrlə təmasa, mənəvi qurtuluşa yol açır. "Qurana təqlidlər"də lirik qəhrəmanın – peyğəmbərin susuzluğu – mənəvi təşnəliyi tanrı tərəfindən əta edilən "səhra suları" ilə yatırılır, ona böyük hikmət və peyğəmbərlik missiyası verilir:

Не я ль в день жажды напоил
Тебя пустынными водами?
Не я ль язык твой одарил
Могучей властью над умами?
Мужайся ж, презирай обман,
Стезею правды бодро следbv уй,
Люби сирот и мой Коран
Дрожащей твари проповедуй.

Xatırladaq ki, səhradakı mənəvi təşnəlik, yolayrıcında qalmaq və xilaskar motivi "Peyğəmbər"də də təkrarlanır:

Духовной жаждою томим,
В пустыне мрачной я влачился,
И шестикрылый серафим
На перепутье мне явился...

Peyğəmbər"dəki bu motiv, "köksün yarılması" və peyğəmbərlik missiyasının verilməsi, yuxarıda qeyd etdiyimiz kimi birbaşa Qurandan, Əl-İnşirah surəsindən ("1. Biz Sənin sinəni açıb genəltmədikmi? 2.

Yükünü üstündən götürmədikmi? 3. Bükmüşdü bu yük belini. 4. Adını-sanını ucaltmadıqmı? 5. Yüngüllük gətirər hər çətin iş - N.Qasımoğlunun tərcüməsi) təbdil edilmişdir:

И он мне грудь рассек мечом,
И сердце трепетное вынул,
И угль, пылающий огнем,
Во грудь отверстую водвинул.

Məhz tənhalıqda, səhralarla əhatələnmiş mağarada verilən bu peyğəmbərlik missiyası ilə əsərin qəhrəmanı sanki yenidən doğulur, ilahi həqiqəti, sinəsindəki müqəddəs odu insanlara çatdırmağa başlayır:

Как труп в пустыне я лежал,
И бога глас ко мне воззвал:
"Восстань, пророк, и виждь, и внемли,
Исполнись волею моей,
И, обходя моря и земли,
Глаголом жги сердца людей".

Beləliklə, Puşkin dühası müxtəlif mədəniyyətləri, ənənələri və dinləri birləşdirməsində və bununlada Şərq-Qərb kolliziyasını aradan qaldırmasındadır. Haqqında danışdığımız hər iki əsərdə də aparıcı xətt olan islam motivləri qədim yəhudi və xristian süjetləri ilə çulğaşır.

Gördüyümüz kimi, Puşkinin oriyental əsərlərinin intertekstual əhatəsi islam, islamda əks olunmuş İncil, Zəbur və Tövrat motivlərini ehtiva edir, əsərdəki lirik süjet isə müxtəlif peyğəmbərlərlə bağlı əhvalatları canlandırır. Məlumdur ki, Musa peyğəmbər (Moisey) qırx il səhrada sərgərdanlıqdan sonra öz xalqını təkallahlılığa etiqada gətirib çıxarmışdı. İsa peyğəmbərdə qırx gün səhrada keçirib, Məhəmməd Peyğəmbər səhradakı dağda tərki-dünya olub. İlk xristian monaxlar, eləcə də sufilər səhrada ilahi həqiqət axtarışında olub. Klassik ədəbiyyatda, o cümlədən, Füzulinin "Leyli və Məcnun"unda da səhra lirik qəhrəmanın ilahi eşq axatarışlarının və iztirablarının məkanıdır. Müsəlman mədəniyyətində səhra ilahi və həm də fəlsəfi düşüncələr məskənidir və bu cəhət həm rus şair və yazıçılarının, həm də alimlərinin diqqətini cəlb etmişdir. Məqsədi haqqa qovuşmaq olan insanın bu məramı səhra rəmzində gerçəkləşən mistik yolla hərəkət vasitəsilə gerçəkləşib. Puşkinin "Peyğəmbər"i də bu məzmunu ifadə edir. Bu şeirin özəlliyi Quran ayələrindən qaynaqlanması ilə bərabər, digər islami mətnlərdən gələn motivləri də əks etdirməsi ilə bağlıdır. Bu əsərin, eləcə də "Qurana təqlidlər" silsiləsindəki hissələrin lirik qəhrəmanı mistik-sufi şairi obrazına çox yaxındır. Bu ənənəyə uyğun olaraq, səhrada mənəvi təşnəlikdən əzab çəkən, fiziki ölüm həddinə çatan, yuxuya dalıb qocalan qəhrəman daxili təkamül mərhələlərini keçir və Allahla ünsiyyət sayəsində peyğəmbər kimi yenidən "doğularaq" öz ilahi missiyasına başlayır. Burada Şərq poeziyasında, o cümlədən Azərbaycan məhəbbət dastanlarında geniş izlənən, qəhrəmanın mənəvi tarnsformasiyası, ona "vergi" verilməsi ilə bağlanan "yuxu" motivindən istfadə də, fikrimizcə, diqqətəlayiq cəhətdir. "Qurana təqlidlər"də səhrada sərgərdanlıqdan taqətdən düşmüş qəhrəman palma kölgəsində yuxuya dalıb uzun illər, qocalana qədər yatır. Ayıldıqda ona ilahi səs əyan olur:

Настал пробужденья для путника час;
Встает он и слышит неведомый глас:
"Давно ли в пустыне заснул ты глубоко?"

Tanrı yatıb qocalmış qəhrəmanı yenidən cavanlaşdıraraq dirçəldir və o, Allahın adı ilə mənəviyyat yolu başlayır. "Qurana təqlidlər"də, "Peyğəmbər"də təsvir və tərənnüm olunan mənzərələr, duyğular, personajlar eyni zamanda cahanşümul miqyas qazanır. Puşkin Quran məzmun və üslubuna uyğun olaraq Allahın bütün kainatı, göyləri, yeri, həyatı yaratdığını, Məhəmmədə işıqlı Quran göndərdiyini və insanların da gözlərini tutmuş dumandan qurtulub işığa qovuşmasının məhz islamın bu müqəddəs Kitabı sayəsində mümkün olacağını yazır:

Зажег ты солнце во вселенной,
Да светит небу и земле,
Как лен, елеем напоенный,
В лампадном светит хрустале.

Творцу молитесь; он могучий:
Он правит ветром; в знойный день
На небо насылает тучи;
Дает земле древесну сень.

"Peyğəmbər" şeirində də ölümcül vəziyyətdə səhrada uzanmış qəhrəmanı ("Как труп в пустыне я лежал, // И бога глас ко мне воззвал") Allahın səsi oyadır və bütün canlı və cansız aləmə nüfuz edən bəsirət gözlərini, qulaqlarını dilini açır, köksünə ilahi od yerləşdirir və bununla da cahanşümul missiya verir:

Перстами легкими как сон
Моих зениц коснулся он:

Tədqiqatçıların göstərdiyi kimi, Puşkinin yaradıcılığında yüksək poetiklik və məna dərinliyi ilə bədii təfsirini tapmış Qurandan gələn bu mənaların və süjetlərin islam mədəniyyətindəki alt mənaları, dini-mənəvi çaları rus oriyental romantizmində bəzən unudulur.

Rus tədqiqatçı P.V.Alekseyev qeyd edir ki, mömin müsəlman əsl "mənəvi ekstaz" keçirmədən özünü dəyərli şəxsiyyət hesab edə bilməz. Əksinə, tədqiqatçı Puşkinin "Peyğəmbər"indəki sətirlərə də («Духовной жаждою томим, / В пустыне мрачной я влачился...») istinad edərək bildirir ki, belə halda müsəlman özünü daxilən boşalmış, aciz və tənha hiss edər. P.V.Alekseyevin fikrincə: "Belə halda rus oriyental romantizmində, yəqin ki, öz seçdiklərinə xəyanət edən, aldadan, görüşə gəlməyən yüngül gözəllərin obrazı meydana çıxacaq... Müsəlman mətnində isə, saxta dünyanın qaçılmaz mövcudluğunu bəlirləyən, gözəlin qəlbinə və ümumən həyatda doğru yol tapa bilməyən aşiq motivinin konnotasiyası olan özünəməxsus "matrisa" meydana çıxır" [5, s.16].

Bu ənənəni Puşkin yaradıcılığı tamamilə dəyişərək, islami motivlərə yeni fəlsəfi-mənəvi məna vermiş, eyni zamanda islamın və digər dinlərin həm mahiyyətini, həm də qarşılıqlı əlaqələrini və bəşəri ideyaları dərindən ifadə edə bilmişdir. Puşkinin Peyğəmbər obrazı İncildəki peyğəmbərlərin və Məhəmməd Peyğəmbərin obrazından qaynaqlanmaqla bərabər, bütövlükdə dünya mədəniyyətində izlənən invariant "peyğəmbər" anlayışına nəşət edir. Eyni zamanda Puşkinin peyğəmbər obrazı romantizm ideallarını, romantik fövqəlqəhrəman anlayışını ifadə edir, cəmiyyətin ülvi ideallara yönəlməsi gərəkliyini vurğulayır. Puşkinn və digər məşhur rus şairlərinin islami şeirlərinin aktuallığı və onlara olan geniş maraq bu əsərlərin fəlsəfi-mənəvi dəyəri ilə bərabər, həm də məhz bu ictimai məzmunu ilə müəyyənləşirdi.

Qeyd edək ki, ictimai ideyalar, sosial həyatın yüksək dini dəyərlərlə tənzimlənməsi, digər dinlərdən fərqli olaraq, islam dinində xüsusi yer tutur. Mənaca Allahın iradəsinə tabelik anlamını bildirən müsəlman anlayışı özü daxili təkamüllə bərabər, ictimai ideallara sədaqəti də ehtiva edir. Yəni islam insan ruhu, mənəviyyatı ilə bərabər, ictimai münasibətləri də tarazlayan bir dindir. Digər tərəfdən, islam digər monoteist dinləri və özündən əvvəlki peyğəmbərləri də qəbul edir, buna görə də universallıq və güclü birləşdirici enerji qazanır. Puşkinin "Peyğəmbər"ində, "Qurana təqlidlər"ində aşkarlanan bu islami enerji də məhz bu mənbədən qaynaqlanır. Hələ lisey illərindən islamla maraqlanan Puşkin islami dəyərləri dərindən mənimsəyərək ifadə edir və eyni zamanda buradakı ideyalara ictimai aktuallıq və funksionallıq aşılamağa müyəssər olur. "Peyğəmbər"in lirik qəhrəmanı "peyğəmbərlik" anlayışının semantikasına zəruri komponent kimi daxil olan təkamül mərhələlərini keçir, onun gözləri, qulağı, nitqi və qəlbi təmizlənir. Bununla o, həm ətraf aləmi, gerçəkliyi, insanları, təbiəti, kosmosu, həm də ideal aləmi, Allahı, kainatın yaradıcısını və idarə edənini dərk etməyə başlayır. Bu mənəvi-ruhsal akt lirik qəhrəmanı seçilmiş şəxsə, peyğəmbərə çevirir və bütün insanlar üçün örnək səviyyəsinə qaldırır. Puşkin islam motivlərini ifadə edərkən, dediyimiz kimi, Şərq ənənəsindən gələn rəmzlərdən geniş istifadə edir. "Kitab", "od", "su", "səhra" kimi rəmzlərlə yanaşı Puşkinin əsərlərində də və ümumən rus romantizminin müsəlman mətnində Şərq ənənəsinə xas rəmzi obrazlardan biri də "quş" obrazıdır. "Peyğəmbər"də qəhrəman "altı qanadlı serafim"lə (И шестикрылый серафим // На перепутье мне явился) təmas qurur. Tanrı, mələklər də peyğəmbərə səmadan müraciət edir, Məhəmməd Peyğəmbərin düşüncələri də səmada pərvazlanır ("В паренье дум благочестивых").

Quş rəmzi adi insanların bilmədiyi xüsusi "dil" anlayışı ilə bağlanır. Qurandan gələn dini ənənədə Süleyman peyğəmbərin "quş dili"ni bildiyi göstərilir. Klassik poeziyamızda da geniş istifadə olunan bu rəmz həmdə sufilərə aid özünəməxsus rəmzlər dilində mövcud simvolikayla bağlıdır.

Puşkinin "Peyğəmbər"ində də "dil"in açılması, peyğəmbərə dünyaya təsir edəcək nitq qabiliyyətinin verilməsi bu kontekstdə xüsusi məna qazanır. Qeyd olunanlardan başqa, Puşkinin sonralar yazdığı digər əsərlərdə, məsələn, "Şair"də qartal obrazı mənəvi ucalıq rəmzi, başqa mətnlərdə ilan İncil və Qurandan gələn motivləri ifadə edir.

Puşkinin müsəlman mətnində islamla bağlı aspektləri yalnız rəmz və motivlər ifadə etmir. Burada lirik süjetin quruluşu və xüsusi kompozisiyanı da qeyd etmək olar. Klassik Şərq ədəbiyyatında, xüsusən, sufi ədəbiyyatında mühüm yer tutan bu motivlər əksər halda ilahi eşq, qəhrəmana "vergi" verilməsi, nakam aşiqin öz eşqi yolunda sərgərdanlığı, cəmiyyətin digər üzvlərindən seçilməsi, ekstaz vəziyyətinə düşərək ərzani və rəbbani dünyalar arasında qalması, "məcnunluq" həddinə çataraq, son nəticədə maddi dünyanı tərk etməsi kimi süjet xətti ilə ifadə olunur. Puşkinin haqqında danışdığımız əsərlərində də qəhrəman oxşar vəziyyətdə, fiziki mənada"ölümcül" haldadır («Как труп в пустыне я лежал...»). Şairin "Peyğəmbər"

şeirini yuxarıdakı kompozisiya-süjet quruluşu baxımından şərh etsək görərik ki, peyğəmbər ağır, iztirablı sərgərdanlıqdan, məchul vəziyyətdən sonra xüsusi hala düşür, qəlbində ilahi eşq alovu yanır, nitqi, eşitmə qabiliyyəti dəyişir, ecazkar səslər eşidir, ona xəyali görüntülər açılır. Puşkin dühası müsəlman mətninin mahiyyətinə vararaq, boz, ölüm saçan səhra mənzərəsini möcüzəli səslər, görüntülərlə canlandırır. Bəsirət gözü açılmış qəhrəman öz ilahi missiyasına məhz bu məkanda başlayır.

Bütün bu dini-fəlsəfi məqamlar Puşkinin haqqında danışdığımız əsərlərində əks olunub, əslində, “Peyğəmbər”in alt qatı qeyd etdiyimiz antropoloji-kosmoqonik modelləri təkrarlayır.

## Ədəbiyat


1. Верещагин Е.М., Костомаров В.Г. Язык и культура. М.: Наука, 1983, 189 с.
2. Прохоров Ю.Е. Национальные социокультурные стереотипы речевого общения и их роль в обучении русскому языку иностранцев. М., Наука, 1996, 177 с.,
3. Лотман Ю.М. Александр Сергеевич Пушкин. Биография писателя. М., Художественная литература, 1987
4. Hacılı A. Qurani Kərim rus ədəbiyyatında. Bakı, 2009
5. Алексеев П.В. Формирование мусульманского текста русской литературы в поэтике русского романтизма 1820-1830-х годов. Автореф. канд. …филол. наук. Томск, 2006, 24 с.,


## Islamic motives in A.S. Pushkin's "Prophet" poem


**Summary**

In the Pushkin's Muslim text, aspects of Islam are not merely symbols and motives. Here is the structure of the lyrical plot and special composition. Pushkin's dharma goes into the essence of the Muslim text and revives the gray, dying wilderness with breathtaking sounds and images. This is where the hero begins his divine mission. If we interpret the poet's poem in terms of the composition and plot structure above, we find that the prophet becomes special in the face of hard, agonizing hardship and desolation, with a divine flame burning in his heart.


## Исламские мотивы в стихотворении А.С. Пушкина «Пророк»


**Резюме**

В мусульманском тексте Пушкина исламские элементы – это не просто символы и мотивы. Они связаны с содержательной стороной текста, а также с сюжетной линией и кмпозиционным построением произведения. Гений Пушкина позвляет предствить мусульманский Восток как символ яркой и интересной жизни н фоне серого быта русского дворянства. В своем стихотворении «Пророк» автор представляет священный образ пророка Мухаммеда. В нем автор представляет момент Видения. Этот священный акт происходит в пустыне. В стихотоврении автор исользует мого символов, заключающих в себе идейную нагрузку произведения.


**Rəyçi: dos. D.F.Hümbətova**


**Məqalə tarixçəsi**

Göndərilib: 18 yanvar 2020 Qəbul edilib: 23 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/43-46
**Turanə Həsənova Uğurlu**
Azərbaycan Universiteti
turane.hasanova96@gmail.com

# XX ƏSR AMERİKA ƏDƏBİYYATINDA YER ALAN KONTRKULTURA FENOMENİ HAQQINDA

***Açar sözlər:*** *sosial-mədəni yenilik, kontrkultura fenomeni, ədəbiyyat, ideologiya*
***Key words***: *socio-cultural innovation, the phenomenon of counterculture, literature, ideology*
***Ключевые слова***: *социокультурные инновации, феномен контркультуры, литература, идеология*

Bildiyimiz kimi, hər bir yeni dövrün mədəniyyəti, özündən əvvəlki sosial-mədəni paradiqmanın tənəzzülünün dərk edilməsindən doğur [1]. Bu zaman, dəyərlərin qiymətləndirilməsində sosial-mədəni yeniliklər mexanizmi kimi kontrkultura özünü necə təzahür edir və nə vaxt, necə hakim mədəniyyətə qarşı yeni mədəniyyət yaranır kimi suallar qarşıya çıxır. Kontrkultura fenomeninə düzgün yanaşmamız, məsələnin tarixi və fəlsəfi əhəmiyyətini,onun funksiyasını və mədəni inkişafını dərindən anlamağa kömək edəcəkdir.

Bildiyimiz kimi, ABŞ-nın bütövlükdə tərbiyə sistemi, yəni, ailə, məktəb, kilsə, kütləvi informasiya vasitələri böyüməkdə olan yeni nəsldə "xoşbəxt təfəkkürün" inkişafına yönəldilmişdir. Belə ki, cəmiyyətdə gənclərə nailiyyət qazanmağın, həyatı sevinclə və şərəflə yaşamağın yolları, müstəqillik, vətənpərvərlik, vətəndaşlıq qüruru və sahibkarlıq kimi xüsusiyyəytlər aşılanması hər kəsə məlumdur. Orta təbəqəyə aid olan amerika ailəsi öz övladlarını liberal, demokratik ruhda tərbiyə etməyə çalışır. Belə bir cəmiyyətdə gəncləri sevirlər və gəncliyi həyatın "qızıl çağı" adlandırırlar. Lakin, əfsuslar olsun ki, müvəffəqiyətin təşviqi və real həyat heç də üst-üstə düşməyə bilər. Hər bir insan, xüsusi ilə gənc yaşlarında, qarşısına məqsədlər qoyur və hədəflərinə doğru irəliləyir. Əlbəttə ki, bu yolda təzadlı, bəzən isə aşılmaz maneələrə rast gəlirlər. Əgər insan qarşısına qoyduğu hədəfə çatmırsa,cəmiyyətdə özünə arzuladığı yeri tuta bilmirsə bax bu zaman onun ümidləri puç olur və beləliklə də "bədbəxt təfəkkür" formalaşır. Məlum məsələdir ki, bu tip hallar əsəb pozuntuları və ağır ruhi travmalara belə gətirib çıxardır. Bu dövrün ən perspektivli gənci haqqında belə Yulina N.A. yazır: "Gələcəkdə ən mötəbər təbəqədə peşəkar hazırlıq keçən ali məktəb tələbələrini, zənci işçi gəncləri ilə müqayisədə kiçik masştablı işsizlik gözləsə də, onları öz karyeralarında yüksəlmək üçün daha nəhəng rəqabət gözləyir [2, 62]"

Tədqiqatçıların fikrincə kontrkultura fenomeni 60-cı illərin sonunda ABŞ-da inkişaf edən solçu-radikal tələbə hərəkatının parlaq istiqamətlərindəndir. Bu dövr, sözügedən hərəkatın yüksəlişi, yeni dəyərlərin və ideallarin axtarışı ilə xarakterizə edilir. Bu haqda Batalov E.Y. yazır ki, "çox da böyük olmayan zaman kəsiyində amerika tarixi nə qədər təzadlı və mürəkkəb yol keçməsinə baxmayaraq iqtisadi yüksəliş və liberalların aktivliyi fonunda yeni mənəvi dəyərlərin, sosial ideallarin axtarışı, utopik eksperimentlər, kütləvi düşüncələrin formalaşması və ruhlanması ilə xarakterizə edilir" [3, 33]. Gənclər hərəkatının nəzəriyyəçilərindən olan Ç.Reyç, T.Rozzak, O.Braun, P.Qudmen, Q.Markuzenin fikrincə, nə siyasi, nə sosial inqilablar yeni "qeyri-repressiv sivilizasiyaya" gətirib çıxarda bilməzdi. Yalnız təfəkkürün, düşüncənin, dəyərlərə yeni baxış buçağının inqilabı, bir sözlə mədəni inqilab yeni sivilizasiyanın dönüş nöqtəsi ola bilərdi. Onlar, kontrkultura termini altında gənclərin subkultura toplusunu, yəni yalnız kontrkultura deyil antikultur, solçuradikalları, sağçıradikalları, kriminal, şovinist, rasist profaşist ideologiyaları da cəmləyir.

Kontrkultura bir cərəyan olaraq nisbətən sabit şəkildə gedən iqtisadi inkişaf dövründə ABŞ-da yaranmışdır. Belə bir iqtisadi çiçəklənmə fonunda isə amerika cəmiyyətinin mənəvi həyatında gedən təzadlar aydın şəkildə nəzərə çarpırdı. Lakin bu məqamda xüsusi qeyd etmək yerinə düşərdi ki, kontrkultura fenomeni solçuradikalların etirazı olaraq iqtisadi səbələrdən irəli gəlməmişdi. Novinskaya M.İ. 60-cı illərin böhranının səbəblərini məhz "mənəvi həyatda dəyişikliklərin labüdlüyü" ilə xarakterizə edir [4, 95]. Məhz bu tip böhran prosesləri də tələbələrin və bir hissə gənc ziyalıların şüurunda öz əksini taparaq mədəniyyətdə, incəsənətdə, estetikada özünü bəyan edir. Davıdov Y.N. və Rodnyanskaya İ.B. bu haqqda yazırlar: "yeni solçular" hərəkatı öz pik nöqtəsinə çatdıqda "qəflətən özlərini çıxılmaz dalanda kimi görüb tez də dağılmağa başlayırlar [5]." Kontrkultura hərəkatı öz ətrafında zamanında ekstremist ideologiyadan və "yeni solçuların" təcrübəsindən ümidsizləşmiş, "daxili inqilab" və "şüurun inqilabı", "hisslərin inqilabı" tərəfdarlarını okkultizm, yoqa və magiyanın və s. köməyi ilə cəmləmişdi. Kontrkultura özünə "bitniklərin" və "yeni solçuların" bir çox fikirlərini, məqsəd və dəyərlərinin hopdurmuşdu [6, 26].

Amerikalı tədqiqatçı D.Heyden sözügedən ideyanın yaranma səbəbləri haqqında danışanda, kontrkultura və fəhlə hərəkatlarını bir-birlərinə əks qoyduğunu görmüş oluruq. Tədqiqatçının fikrincə, kontrkultura qərb

mədəniyyətinin dəyərlərini, "amerika həyat tərzinin" ümumiyyətlə, elmi-texniki tərəqqinin cəmiyyətin inkişafında heç bir rolu olmadığından məyyus olan gənc kütlənin hərəkatı kimi xarakterizə etmək olar. Daha sonra müəllif qeyd edir ki, sənayenin inkişaf etməsi heç də insanların maddi həyatlarının yüksəlişini təmin etmədiyini özlərinə şüar edən gənclər hərəkatı olan kontrkultura kimlərinsə maddi durumunun yaxşılaşmasını vəd edən "bu cəmiyyətin nə öz vətəndaşlarına mənəvi çiçəklənməyə zəmanət verəcəyini", nə də həyatlarına bir məna qatacağını vəd etmədiyi göz qabağında idi [7, 22].

Bir sözlə, kontrakulturanın etiraz dalğası maddi həyatın ənənəvi problemləri və "həyat keyfiyyətinin" yeni məsələlərindən fərqli olduğuna əsaslanırdı. Doğrudan da, ideallların yoxluğu, siyasi fikirlərin olmaması insanların mənəvi düşüncələrində qarışıqlıq yaradırdı. Bunun nəticəsində isə insan bütün rasional düşüncələridən uzaqlaşaraq mistik, okkultik bəzən isə daxili dünyasına qapılaraq özü ilə ilə təkpətək qalaraq, varlığını üzən ağır yükdən - fikirlərindən azad olmaq istəyirdi. Qeyd etmək lazımdır ki, kontrkulturanın sosial bazasını gənclər, elit universitetlərin tələbələri, elmi və yaradıcı ziyalılar təşkil edərək "etiraz mədəniyyətinin yeni sinfini" formalaşdırmışdır. Beləliklə də, etiraz fırtınasının mərkəzini fəhlə sinfi təşkil etsə də onun dalğaları cəmiyyətin mötəbər qatlarına kimi yayılırdı [8, 259]. Daha sonralar hippi və yippi, mod və ted subkulturalarına pank və rokerlər, qamler və diqerlər qoşulmağa başlayır. Lakin onlar artıq cəmiyyətin başqa sosial təbəqəsinin nümayəndələri idilər. Bunlar əsasən fərqli dəyərləri və məqsədləri olan əyalətdən gələn gənclər, kasıb, problemli ailələrin övladları idi. Xarici atributlarına və hakim dairələrlə mübarizə metodlarına görə oxşar olan sözügedən subkulturalar da "kontrkultura" termini altında cəmlənirdi. Kontrkultura hərəkatı çərçivəsində gənclər mövcud mənəvi normalara, yaşlı nəslin stereotiplərinə etiraz edir və qadağaları pozaraq özlərinin bənzərsiz ekstravaqant davranışları, geyimləri, saç düzümlərində yeni tərz, həyat norması nümayiş etdirirdilər. Məhz, bu tərz davranışların məqsədi yaşlı nəsildən fərqlənmək və öz hərəkətlərinə cavab olaraq onlarda panika, təəccüb yaradıb düşündürmək idi. Qeyd etmək lazımdır ki, kontrkulturanın nüvəsi hesab edilən hippiyə gənclərin geniş bohema dairəsini və tələbə subkulturalarını aid edirlər. Sosioloqların fikrincə hippinin tərkibində ali məktəbləri yarımçıq qoyub "maddi" cəmiyyətdən nəyin bahasına olursa olsun "can qurtarmaq" istəyən və bu yolda dini mistika və narkotiklərdən belə istifadədən çəkinməyən gənclər daxil idi. Hippinin dünyagörüşü prinsipləri və xarici atributları bitnikərdən (50-ci illərdə gənclərin subkulturası) alınmışdır. Yeri gəlmişkən qeyd etmək lazımdır ki, bitniklərə dzen-buddizmin və dini mistikanın güclü təsiri olmuşdur. Nihilizm, şərq dühaları və "bambuk düzənliyində yeddi müdrik" ideyaları bitniklərə, eləcə də 60-cı illərin gəncliyinin kontrkulturalarına ruhən çox yaxın idi. Belə ki, bir neçə əsr bundan qabaq buddizm monarxları konfusiyaçı dövlət ideologiyasına qarşı etirazını bildirmək üçün gündəlik məişət işlərinə, var-dövlətə biganəlik göstərir, saçlarını uzadır, geyimlərinə fikir vermirdilər. Buradan da yəqin etmək olur ki, müasir kontrkulturadakı geyim və saç düzümlərindəki sadaladığımız "kod" qədimdə mövcud olana ənənəvi dini etirazın təsiri altında formalaşmışdır. Dzen-buddizm isə özü-özlüyündə, hakim dairələri və ona "xidmət edən" xristian kilsələrini inkar edən kontrkultura hərəkatını dalğalandıran gənclər üçün elə hazır dini format idi. Qərbin kontrkultura hərəkatına qoşulan gəncləri böyük həvəslə dzen-buddizm dühasına, daha dəqiq desək burada cəmiyyətin maraqlarından çox şəxsi maraqların prioriteti, insanlarda irrasional, mənəvi dəyərlərin üstünlük təşkil etməsi, kimi dünyagörüşlərinə və ideyalarına əsaslanaraq həmrəy toplaşmışmaları dəqiq görünürdü. Məhz, "kiçik də olsa- gözəldir", "burada və bu an" kimi yaşamaq və yaratmaq şüarları elə buradan götürülmüşdür.

Bundan başqa şərqdə din insanları dözümlüyə, ruhun, fikrin və bədənin harmoniyasına, özünü tərbiyə, bütün canlılara hörmət kimi prinsiplərlə gəncliyi, əsasən hippiçiləri cəlb edirdi. Meditasiya seansları isə ruhun əzablarıdan can qurtarmağa böyük köməklik göstərirdi.

Məlumdur ki, şərq ənənələrinə görə insanın enerjisi ətrafa deyil, onun daxilinə, yəni özünütərbiyəyə, özününəzarətə yönəlmişdir. Belə bir ezoterik təcrübəyə əsaslanaraq hippilər kommunalarında yeni neortodoksal mənəvi ənənələr yaratmağa can atırdılar. Ümumiyyətlə, kontrkultur nəzəriyyələri özündə Qərbin və XX əsrin sonuncu onilliklərinin gəncliyinin və ziyalılarının mənəvi dünyasını inkişaf etdirə biləcək, keçmiş və müasir mütəfəkkirlərin qabaqcıl fikirlərini cəmləyir. Məhz bu fikirlər həmin dövrün mədəniyyət və incəsənətinə, ədəbiyyatına, yazıçı və rəssamların yaradıcılığına, bir sözlə cəmiyyətinin mənəvi təfəkkürünə təsir göstərərək tamamilə yeni bir humanist yönümlü mentalitet formalaşdırırdı. Çünki, kontrkultura eyni çərçivə daxilində qərb və şərq dünya mədəniyyətləri arasında gözə görünməz bir körpü yaradır, şərqin təcrübəsi və üsullarını yenidən canlandıraraq ətraf aləmi yenidənqurmağa deyil, onunla qovuşmağa vasitə olaraq çıxış edirdi.

Bildiyimiz kimi, yer üzündə çoxlu sayda unikal mədəniyyətə və etik təcrübəyə malik millət və xalqlar yaşayır. Bu plyuralistik paradiqmanı təsdiq edə biləcək bir çox humanitar, məsələn, etnososiologiya, fəlsəfi antropologiya və s. kimi elmi sahələr vardır ki, onlar cəmiyyətin xətti inkişafını anlayır və hegemon hakimiyyətin ənənəvi şüarları ilə deyil, "yalnız irəliyə doğru" fikirləri ilə qeyri - ierarxik cəmiyyətdə insan

varlığının mühüm rolunu vurğulayırdı. Qeyd etmək yerinə düşərdi ki, 50-60-ci illərin ziyalılarının və tələbələrinin dünyagörüşü "faciəli stoitizm" kimi ekzistensializm fəlsəfəsinin ideyalarının təsirindən formalaşmışdır. Ekzistensializm ilk növbədə, həyatda insanın qarşısıına çıxa biləcək bütün çətinliklərdən qürurla və şəxsiyyətini qoruyaraq çıxmağı, əxlaqlı yaşamağın vacibliyinin əsas olduğunu ön plana çəkir. Ekzistenzializmin bu kimi ideyalarını qəbul edən kontrkultura isə, öz növbəsində, insanı təbiətin ən qiymətli varlığı hesab edərək "faciəli stoitizm" fəlsəfəsi ilə heç də razılaşmırdı. Onlar insanı xoşbəxt edəcək sevgiyə inanır və onun xoşbəxt olmasını vacib hesab edirdilər. Daha sonra onlar insanların xoşbəxtliyini tərəfdən təmin edilməsini tələb edir, əks halda belə bir cəmiyyətin heç kimə lazım olmadığını israrla vurğulayırdılar. Məhz elə bu fikirlər özündə kontrkulturanın "Böyük etirazını", "radikal inkarın" əsasını əks etdirirdi.

Danılmaz faktdır ki, kontrkultura sayəsində Qərbin mədəniyyət və incəsənət aləmi bir tərəfdən daha yetkin formalar qəbul edir və bədii təcrübəsinə uyğun olan özünəməxsus estetikanı-avanqard tərzi formalaşdırırdı. Digər tərəfdən avanqard cərəyanı həyatımızın hər bir sahəsinə sirayət etmişdir. Belə ki, o müasir dəbdə, rəssamlıqda, musiqidə, kompyuter və interyerlərin dizaynlarında öz əksini yetərincə tapmışdır. Qeyd etmək yerinə düşərdi ki, kontrkulturanın mütərəqqi ideyaları humanitar nəzəriyyələrin metodoloji və fəlsəfi, sosial eksperimentlərin nəzəri əsaslarını qoyaraq, "alternativ" hərəkatların yönəlməsində böyük yer almışdır.

Qeyd olunan faktları nəzərə alaraq demək olmaz ki, solçu radikalların üsyanının zəifləməsi bədii və ictimai həyatda izsiz qalıb. Kontrkultura haqqında yazılan ədəbiyyatlardan birində qeyd edilir ki, "sözsüz, ötən onilliklərdə sözügedən fenomenin təsiri tariximizdən nə "yaz suları" kimi axıb getmiş, nə də dağılmışdı. Onun təsiri hələ də davam etməkdədir. Belə ki, sözügedən fenomen metamorfoz dəyişikliklərə uğrayaraq daha böyük zaman kəsiklərinə yol taparaq, kitablarda, musiqidə, teatr səhnələrində, indiki zamanın həyat tərzini nümayiş etdirmişdir. Bu məqamda isə fikrimizdə maraqlı suallar yaranır: görəsən kontrkulturanı yaşadan və bu qədər cazibəli edən nədir? Nə səbəbdən o, onilliklər ötməsinə baxmayaraq gənclərin və geniş əhali kütləsinin həyat yolu seçimində köməklik etməkdə davam edir. Lakin ilk baxışda suallar asan görünsə də onlara cavab vermək çox çətinlik yaradır. Çünki, kontrkultura sosiokultur fenomen olaraq çox mürəkkəb hadisədir. Maraqlıdır ki, uzun illər tədqiqatçıların nəzərini kontrkulturanın təzadlı və neqativ tərəfləri cəlb etmişdir, geniş əhali kütləsi böyük maraqla kontrkulturanın pozitiv xüsusiyyətlərini, yəni hərbi-sənaye kompleksini və dolları kulta çevirən istehlakçı cəmiyyəti tənqid etməsini, insanların bir-birlərinə və təbiətə humanist davranışa səsləməsini alqışlayırdı.

**Ədəbiyyat**

1. https://iphras.ru/uplfile/root/biblio/2009/Sultanova.pdf
2. Юлина Н.С. Бунтующая молодежь в поисках идеологии // США: экономика, политика, культура. 1974. № 7. С. 62.
3. Баталов Э.Я. Леворадикальная традиция... С. 33.
4. Новинская М.И. Молодежь в современном мире: Проблемы и суждения (Круглый стол) // Вопр. Философии. 1975. № 5. С. 95.
5. (Давыдов Ю.Н., Роднянской И.Б. Социология контркультуры: критический анализ (Инфантилизм как тип мировосприятия и социальная болезнь). М.: Наука, 1980.
6. (Давыдов Ю.Н. Эстетика нигилизма: искусство и «новые левые». М., 1975. С. 259.
7. Hayden D. Seven American Utopias: the architecture of communitarian socialism, 1970–1975. Cambridge (Mass.) 1976. P. 22.
8. Давыдов Ю.Н. Эстетика нигилизма: искусство и «новые левые». М., 1975. С. 259.

**О феномене контркультуры, занявшей место в американской литературе XX века**

**Резюме**

Контркультура возникла в Соединенных Штатах Америки во время относительно устойчивого экономического развития. Феномен контркультуры возник не по экономическим причинам, как протест левых радикалов. Человек стремился освободиться от тяжелого бремени своего существа, отойти от рационального мышления и остаться наедине с собой, войти в таинственный, оккультный, а иногда и внутренний мир. Социальная база культа была организована молодежью, студентами элитных университетов, научной и творческой интеллигенцией и сформировала «новый класс протестной культуры». Контекстуалистические теории объединяют передовые идеи прошлых и современных мыслителей, которые развиваşт духовный мир молодежи и интеллектуалов Запада и последних десятилетий двадцатого века. Именно эти идеи оказали влияние на культуру и искусство,

литературу, писателей и художников того времени и, одним словом, на мораль общества, сформировали совершенно новый гуманистически направленный менталитет.

**About phenomenon of counterculture, which take a place in the American literature of the twentieth century**

**Summary**

The counterculture emerged in the United States during a relatively steady economic development. The phenomenon of counterculture is leftist

the radicals did not come for economic reasons. Man sought to free himself from the heavy burdens of his existence, by moving away from all rational thoughts and being alone with himself, entering the mystical, occult and sometimes his inner world. The social base of the cult was organized by young people, students of elite universities, scientific and creative intelligentsia and formed a "new class of protest culture." Contextualist theories combine advanced ideas of past and modern thinkers, who can develop the spiritual world of youth and intellectuals of the West and the last decades of the twentieth century. It was these ideas that influenced the culture and art, literature, writers and artists of that time, and, in a word, the morality of society, formed a completely new humanistic mentality.

**Rəyçi: prof. Q.Quliyev**

**Məqalə tarixçəsi**
Göndərilib: 19 yanvar 2020 Qəbul edilib: 24 yanvar 2020

## HÜQUQ THE LAW ПРАВО

DOI: 10.36719/AEM/2007-2020/50/47-50

**Kənan Azər oğlu Qazıyev**
Azərbaycan Respublikası Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası

# MÜSTƏQİL AZƏRBAYCANDA KORRUPSİYAYA QARŞI MÜBARİZƏ SAHƏSİNDƏ ATILAN ADDIMLAR

***Açar sözlər:*** *Azərbaycan Respublikası, Korrupsiya, Şəffaflıq, İslahat, Dövlət idarəçiliyi, Asan Xidmət*
***Keywords:*** *Republic of Azerbaijan, Corruption, Transparency, Reform, Public Administration, Easy Service*
***Ключевые слова:*** *Азербайджанская Республика, коррупция, реформа, государственное управление, простое обслуживание*

Adı əsasən bürokratik aparat və siyasi elita ilə bağlı işlənən korrupsiya termininin mənasını qısa şəkildə demokratiyadakı bütün fərdlərin hüquq qarşısında bərabərliyi prinsipini ortadan qaldıran, imkanları bərabər şəkildə əldə etmək prinsipini zədələyən kimi izah etmək yerinə düşərdi [1]. Bunlarla yanaşı, korrupsiya qanunun aliliyinə qarşı duyulan hörmətə də böyük zərər verir, siyasi nüfuz xalqın dəstəyindən məhrum qalır, iqtidar ilə xalq arasında uçurum yaranır.

Dövlət idarəetməsi sahəsində həyata keçirilən siyasətin əsas məqsədi səmərəli və demokratik idarəçiliyin, dövlət orqanlarının fəaliyyətində şəffaflığın, operativliyin, çevikliyin və nəticə etibarilə ölkə vətəndaşlarının rifah və məmnunluq səviyyəsinin təmin olunmasıdır. İslahatların gündəmində səmərəli, şəffaf idarəetmə mexanizmin yaradılması ilə yanaşı, dövlət qulluğuna ictimai etimadın artırılması, korrupsiyaya qarşı səmərəli mübarizə sisteminin, vətənpərvər, peşəkar və intellektual dövlət qulluqçuları korpusunun formalaşdırılması kimi mühüm məsələlər də öz yerini tapır.

Dövlət qulluğu dövlət idarəçiliyini həyata keçirən əsas mexanizm olduğu üçün muasir dövrdə qloballaşma prosesi nəticəsində dövlət idarəçiliyində ortaya çıxarılan yeni paradiqmalar və həyata keçirilən yeni islahatlar dövlət qulluğunu da bu paradiqma və islahatlara uyğun olaraq formalaşdırmaqdadır [5].

Müstəqil Azərbaycan dövlətinin prezidenti kimi ulu öndər ölkənin müasirləşməsinin əsas istiqamətlərini azad bazar münasibətlərinə əsaslanan iqtisadiyyatın, açıq vətəndaş cəmiyyətinin və demokratik dövlət institutlarının gücləndirilməsində görürdü. Bu isə, təbii olaraq, Azərbaycanda korrupsiya və neqativ hallara qarşı mübarizənin yeni səviyyədə qurulmasını tələb edirdi. 1990-cı illərin ikinci yarısında ümummilli liderin təşəbbüsü ilə korrupsiya ilə mübarizəyə dair bir sıra normativ aktlar qəbul edildi. Bu sənədlərdə korrupsiyaya qarşı mübarizənin strateji kursu müəyyən edildi və antikorrupsiya tədbirləri prioritet sahə kimi qiymətləndirildi.

Ümummilli lider dövlət orqanlarında süründürməçiliyə, bürokratik əngəllərə yol verməməyi, şəffaflığı təmin etməyi dövlət qulluqçularının qarşısında əsas vəzifə kimi qoymuş və dövlət qulluğunun müasir konsepsiyasını formalaşdırmışdı.

Bütün digər sahələrdə olduğu kimi, korrupsiya ilə mübarizə sahəsində də ümummilli lider tərəfindən əsası qoyulmuş strategiya bu gün də davam etdirilməkdə, bu sahədə də ardıcıllıq təmin edilməkdədir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin möhkəm siyasi iradəsi və ciddi nəzarəti altında ölkəmizdə korrupsiyaya qarşı mübarizə sahəsində institusional və qanunvericilik islahatları həyata keçirilmişdir.

2004-cü ildə "Korrupsiyaya qarşı mübarizə haqqında" Qanun, korrupsiyaya qarşı mübarizə üzrə 2004-2006-cı illəri əhatə edən Dövlət Proqramı qəbul olunması mövcud qanunvericilik bazasını əhəmiyyətli dərəcədə gücləndirmişdir. "Korrupsiyaya qarşı mübarizə haqqında" Qanun korrupsiya ilə əlaqədar hüquqpozmaların aşkar edilməsi, qarşısının alınması və nəticələrinin aradan qaldırılmasına, sosial ədalətin, insan və vətəndaş hüquqlarının və azadlıqlarının müdafiə olunmasına, iqtisadiyyatın inkişafı üçün əlverişli şəraitin yaradılmasına, dövlət orqanlarının və yerli özünüidarəetmə orqanlarının, vəzifəli şəxslərin fəaliyyətinin qanuniliyinin, şəffaflığının və səmərəliliyinin təmin edilməsinə yönəlmişdir. Bu Qanun, həmçinin dövlət orqanlarına əhalinin etimadının möhkəmləndirilməsi, peşəkar kadrların dövlət orqanlarında və yerli özünüidarəetmə orqanlarında qulluğa girməyə həvəsləndirilməsi, həmin şəxslərin korrupsiya ilə əlaqədar hüquqpozma törətməsini istisna edən şəraitin yaradılması məqsədini daşıyır. 2007-ci ildə Şəffaflığın artırılması və korrupsiyaya qarşı mübarizə üzrə Milli Strategiya və onun həyata keçirilməsi ilə bağlı 2007-2011-ci illər

üçün Fəaliyyət Planı təsdiq edilmişdir. Strategiyada bu sahədə qanunvericiliyin təkmilləşdirilməsi, dövlət və yerli özünüidarə orqanlarının, korrupsiyaya qarşı mübarizə sahəsində ixtisaslaşmış qurumların, hüquq mühafizə orqanlarının və məhkəmələrin fəaliyyətinin təkmilləşdirilməsi, sosial-iqtisadi xarakterli islahatların aparılması, qabaqcıl beynəlxalq təcrübənin tətbiqi kimi tədbirlər nəzərdə tutulmuşdur.

Həmin dövrdə korrupsiyanın qarşısının alınması sahəsində ixtisaslaşmış orqan kimi fəaliyyət göstən Azərbaycan Respublikasının Korrupsiyaya qarşı mübarizə üzrə Komissiyası və korrupsiya ilə bağlı cinayətlər üzrə həyata keçirilən ibtidai istintaq sahəsində ixtisaslaşmış qurum olan Baş prokuror yanında Korrupsiyaya qarşı Mübarizə Baş İdarəsi fəaliyyətə başlamışdır. Bundan əlavə, 2008-ci ildə qəbul olunan "Azərbaycan Respublikasında korrupsiyaya qarşı mübarizənin gücləndirilməsinə dair tədbirlər haqqında" Fərman dövlətin bu sahədə strateji kursunu müəyyən etmişdir. Ötən illər ərzində korrupsiyaya qarşı mübarizədə qabaqcıl ölkələrin iş təcrübəsi mütəmadi olaraq öyrənilmiş, republikamız bu məqsədlə bir neçə beynəlxalq sənədə, o cümlədən Avropa Şurasının "Korrupsiya ilə əlaqədar cinayət məsuliyyəti haqqında", "Korrupsiya ilə əlaqədar mülki-hüquqi məsuliyyət haqqında" və Birləşmiş Millətlər Təşkilatının "Transmilli mütəşəkkil cinayətkarlığa qarşı" konvensiyalarına, həmçinin "Korrupsiyaya qarşı Birləşmiş Millətlər Təşkilatının Konvensiyası"na qoşulmuşdur.

İqtisadi sahədə törədilən cinayətlərə görə məsuliyyətin yüngülləşdirilməsi və dekriminallaşdırılması ilə əlaqədar Cinayət Məcəlləsinə dəyişikliklər edilmiş, tikilməkdə olan və ya tikilmiş, istismara qəbul edilməmiş çoxmənzilli binalarda mənzillərin bir neçə şəxsə satılması kimi mənfi halların qarşısının alınması məqsədilə Mülki Məcəlləyə dəyişikliklər olunmuşdur. Etik davranış qaydalarının əhatə dairəsinin genişləndirilməsi ilə əlaqədar Milli Məclisin deputatlarının və bələdiyyə üzvlərinin etik davranış qaydaları haqqında qanunlar qəbul edilmişdir.

Həmçinin məhkəmə sistemində şəffafliğin artirilmasi üzrə əsasli tədbirlər görülür. Ölkəmizin ictimai-siyasi həyatında müsbət rezanons doğuran Məhkəmə-hüquq sistemində islahatların dərinləşdirilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 3 aprel 2019-cu il tarixli Fərmanı bu baxımdan həyata keçirilən məhkəmə-hüquq islahatlarının uğurlu davamı kimi qiymətləndirilməlidir.

Respublikada həyata keçirilməkdə olan köklü məhkəmə-hüquq islahatlarının mühüm tərkib hissəsi olmaqla bu strateji sahənin gələcək inkişafı üçün prioritetləri müəyyən edən mühüm əhəmiyyətli sənədin imzalanması bir tərəfdən cəmiyyətdə yüksək nüfuza malik ədalət mühakiməsinin formalaşdırılması prosesini sürətləndirmək məqsədilə məhkəməyə müraciət imkanlarının daha da genişləndirilməsi, məhkəmələrin fəaliyyətində şəffaflığın artırılması, məhkəmə icraatının effektivliyinin yüksəldilməsi, məhkəmə qərarlarının tam və vaxtında icra edilməsinin təmin olunması, o cümlədən də süründürməçiliyin və digər neqativ halların aradan qaldırılması üçün görülən tədbirlərin gücləndirilməsinə xidmət edirsə, digər tərəfdən də dövlət başçısı tərəfindən cinayət-hüquq siyasətinin liberallaşdırılması və cinayətlərin dekriminallaşdırılması məqsədilə imzalanmış 10 fevral 2017-ci il tarixli Sərəncamda icrası nəzərdə tutulan kompleks institusional, qanunverici və praktiki islahatların keyfiyyətcə yeni mərhələyə keçid etməsinə mühüm təkan verir [4].

Bu sahədə mütərəqqi islahatların davam etdirilməsi ədalət mühakiməsinin səmərəliliyinin artırılmasında İKT tətbiqini zəruri edir. Bu sahədə bir çox tədbirlər həyata keçirilir, yeni məhkəmə binaları müasir qurğu və idarəetmə proqramları ilə təchiz edilir. Sürətli sosial-iqtisadi dəyişikliklər, dövlət idarəçilik mexanizmlərinin müasirləşdirilməsi, məhkəmə-hüquq sisteminin təkmilləşdirilməsi, demokratik təsisatların möhkəmləndirilməsi məhkəmə sistemində də yeni iş üsul və vasitələrinin, bu sahədə yeniliklərin tətbiqini zəruri edir. "Elektron imza və elektron sənəd haqqında" Azərbaycan Respublikası Qanunu qəbul edilmişdir.

Hazırda ölkəmiz korrupsiyaya qarşı mübarizə sahəsində olan bütün beynəlxalq təşəbbüslərin aktiv iştirakçısıdır, bu sahədə olan beynəlxalq konvensiyaları ratifikasiya və icrasını uğurla təmin etmişdir. Avropa Şurasının Korrupsiyaya qarşı Dövlətlər Qrupu (QREKO) ölkəmiz tərəfindən həyata keçirilən tədbirləri yüksək qiymətləndirmişdir.

Azərbaycan 2011-ci ildə beynəlxalq səviyyədə başlanan Açıq Hökumət Tərəfdaşlığına qoşulan ilk dövlətlərdən biri idi.

Son 15 il ərzində korrupsiyaya qarşı mübarizə sahəsində 5 dövlət proqramı qəbul olunmuş, icrası uğurla təmin edilmişdir.

Korrupsiyanın qarşısının alınması sahəsində mütəmadi olaraq sistemli təlim və maarifləndirmə tədbirlərinin həyata keçirilməsi də diqqət mərkəzindədir. Avropa Şurası və Avropa İttifaqı ilə birgə əməkdaşlıq şəraitində dövlət qulluqçuları və tələbələr üçün etik davranış qaydaları və antikorrupsiya mövzuları üzrə tədris proqramı hazırlanıb, yerli təlimçi bazası formalaşdırılıb, regionlarda müxtəlif hədəf qrupları üçün təlimlər keçirilib. Bundan başqa, bir müddət əvvəl ölkəmizin dəstəyi ilə Bakıda üzvlərinin böyük əksəriyyəti İslam dövlətlərindən olan İqtisadi Əməkdaşlıq Təşkilatına (ECO) üzv dövlətlərin prokurorluq, ixtisaslaşdırılmış korrupsiyaya qarşı mübarizə qurumları rəhbərlərinin və ombudsmanlarının üçüncü iclası keçiril-

mişdir. Həmin tədbirə Türkiyə, İran, Qazaxıstan, Pakistan, Əfqanıstan, Qırğızıstan, Özbəkistan, Tacikistan və Türkmənistanın dövlət qurumlarının, eləcə də ECO, Beynəlxalq Antikorrupsiya Akademiyasının (IACA) rəhbər vəzifəli şəxsləri qatılmışlar.

Bundan başqa, Avropa İttifaqının Avropa Qonşuluq Siyasətinin "Şərq tərəfdaşlığı" və TAİEX (Texniki Yardım və İnformasiya Mübadiləsi) aləti çərçivəsində, Korrupsiyaya Qarşı Avropa Tərəfdaşları Təşkilatı (EPAC) və Korrupsiyaya Qarşı Avropa Əlaqələndiricilər Şəbəkəsi (EACN), Avropa Şurasının Korrupsiyaya Qarşı Mübarizə Aparan Dövlətlər Qrupu (GRECO), Beynəlxalq Prokurorlar Assosiasiyası (IAP), Beynəlxalq Anti-Korrupsiya Akademiyası (IACA), Demokratiya və İqtisadi İnkişaf Naminə Təşkilat (GUAM) və digər qurumlarla səmərəli əməkdaşlıq davam etdirilmiş və bu gün həmin əməkdaşlıq daha da genişləndirilir [3].

Azərbaycanda artıq dövlət orqanları ilə vətəndaşlar arasında münasibətlər tamamilə yeni müstəvidə həyata keçirilir. Dövlət qulluqçuları ilə vətəndaşlar arasında birbaşa təmaslar minimuma endirilir, nağdsız ödənişlərin həcmi artırılır, əhaliyə göstərilən elektron xidmətlərin dairəsi və dövlət idarəçiliyində informasiya-kommunikasiya texnologiyalarının tətbiqi genişləndirilir. Bu tədbirlər dövlət orqanlarının işində şəffaflığın təmin edilməsi və dövlət orqanlarında korrupsiyanın qarşısının alınması sahəsində müsbət mənada çox böyük dəyişikliklərə səbəb olmuşdur.

Dövlət orqanları ilə vətəndaşlar arasında münasibətin yeni formatından, dövlət orqanlarında şəffaflıqdan danışdıqda ilk yada düşən, əlbəttə ki, "ASAN xidmət" mərkəzləri olur. Əminliklə demək olar ki, Azərbaycan Respublikasının Prezidentinin 2012-ci il 13 iyul tarixli fərmanı ilə yaradılmış "ASAN xidmət" mərkəzləri dövlət orqanları-vətəndaş münasibətlərində inqilabi dəyişikliyə nail oldu.

Prezident İlham Əliyevin ideya müəllifi olduğu "ASAN xidmət" mərkəzlərinin yaradılmasında məqsəd dövlət orqanlarının xidmətlərinin göstərilməsində vətəndaş məmnunluğunun, şəffaflığın təmin edilməsi, korrupsiya hallarının istisna edilməsi, müasir texnologiyaların tətbiq edilməsi, dövlət qulluqçusu-vətəndaş münasibətlərində yeni düşüncə tərzinin formalaşdırılması olmuşdur.

"ASAN xidmət" mərkəzlərində dövlət orqanları, özəl şirkət və müəssisələr tərəfindən ümumilikdə 320-dən çox müxtəlif xidmət göstərilir. Dövlət xidmətlərinin "ASAN xidmət" standartlarına uyğunluğunu yoxlamaq məqsədilə dövlət orqanlarının xidmətləri "ASAN xidmət indeksi"ni təşkil edən parametrlər üzrə qiymətləndirilir. Əhaliyə mərkəzin fəaliyyəti barədə mütəmadi məlumat vermək, təklif və şikayətləri dinləmək üçün "ASAN radio" və 108 "Çağrı" mərkəzi fəaliyyət göstərir.

Bu günə kimi "ASAN xidmət" mərkəzlərinə daxil olan müraciətlərin sayı 28 milyondan çoxdur. Keçirilən rəy sorğularına əsasən vətəndaşların xidmətlərdən məmnunluq əmsalı 99,6 faiz təşkil edir [2].

Dövlət qulluğu sisteminə gətirilmiş başqa bir yenilik dövlət orqanlarının fəaliyyətinə gənc könüllülərin cəlb edilməsidir. Gənclərə xüsusi diqqət, dövlət idarəçiliyində onların potensialından geniş istifadə olunması Heydər Əliyev siyasətinin mühüm tərkib hissəsi idi. Azərbaycanda Gənclər Gününün təsis edilməsi də məhz ümummilli liderin adı ilə bağlıdır. Bu gün qürur hissi ilə deyə bilərik ki, ulu öndər Heydər Əliyevin gənclər siyasəti dövlət idarəçiliyində uğurla həyata keçirilir.

**Ədəbiyyat**

1. https://az.wikipedia.org/wiki/Korrupsiya
2. https://mia.az/w781284/fuad-elesgerov-meqale-yazdi-tam-metn
3. http://xalqqazeti.com/az/news/292
4. http://www.genprosecutor.gov.az/news/140/20194/mehkeme-huquq-sisteminde-islahatlarin-derinlesdirilmesi-korrupsiyaya-qarsi-mubarize-prizmasinda
5. https://kafkassam.com/korrupsiyaya-qarsi-mubariz%C9%99-az%C9%99rbaycanda-atilanaddimlar.html?fbclid=IwAR3IdeyNdjZIpC8TyOhB8fFOfEFVgspsN_b5HtilS3UtlFR_KdM-j-DH1n0

**Decisions taken in the field of struggle against corruption in independent Azerbaijan**

**Summary**

Fighting corruption is one of the main goals that each state has chosen to pursue a democratic and civilized development. Social causes are described as one of the main causes of corruption. It is assumed that the participation of officials in corruption and bribery not only in Azerbaijan, but also in other developing countries, is directly related to their lower official income. The experience of developed and developing countries shows that e-reform in the fight against corruption is the most effective method of combating corruption. The article outlines a number of laws, programs, and international conventions that have been adopted by the government as part of anti-corruption policy in Azerbaijan in recent years.

**Решения, предпринятые в области борьбы против коррупции в независимом Азербайджане**

**Резюме**

Борьба с коррупцией является одной из основных целей, которые каждое государство выбрало для демократического и цивилизованного развития, а социальные причины рассматриваются как одна из основных причин коррупции. Предполагается, что участие чиновников в коррупции и взяточничестве не только в Азербайджане, но и в других развивающихся странах напрямую связано с их более низким официальным доходом. Опыт развитых и развивающихся стран показывает, что электронная реформа в борьбе с коррупцией является наиболее эффективным методом борьбы с коррупцией. В статье описывается ряд законов, программ и международных конвенций, которые были приняты правительством в рамках антикоррупционной политики в Азербайджане в последние годы.

**Rəyçi: A.A.Usubəliyev**

**Məqalə tarixçəsi**
Göndərilib: 27 yanvar 2020 Qəbul edilib: 29 yanvar 2020

**SOSİOLOGİYA SOCIOLOGY СОЦИОЛОГИЯ**

DOI: 10.36719/AEM/2007-2020/50/51-53

**Zəhra Qüdrət qızı Teymurlu**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası

# AZƏRBAYCANDA ƏLVERİŞLİ İNVESTİSİYA MÜHİTİNİN FORMALAŞDIRILMASI İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *investisiya, iqtisadiyyat, iqtisadi artım, inkişaf*
***Key words:*** *investment, economy, economic growth, development*
***Ключевые слова:*** *инвестиции, экономика, экономический рост, развитие*

## Giriş

Müasir dövrdə hər bir ölkənin inkişafında investisiyaların rolu xüsusi əhəmiyyət kəsb edir. İnvestisiyalar təhlükəsiz iqtisadi artımı və ölkə iqtisadiyyatında rəqabət qabiliyyətini təmin edir, əhalinin həyat səviyyəsinin yüksəldilməsinə zəmin yaradır. İnvestisiyaların artımını təmin etmək üçün bazar infrastrukturunun genişləndirilməsi və təkmilləşdirilməsi, iqtisadi artımı təmin etmək üçün isə investisiyaların iqtisadiyyatın prioritet sahələrinə yönəldilməsi, iqtisadiyyatın quruluşunda elm tutumlu sahələrin payının artırılması zəruri hesab olunur [3].

Azərbaycan müstəqillik əldə etdikdən sonra, yəni açıq iqtisadiyyat formalaşdıqdan sonra dünyanın bir sıra ölkələrindən cəlb olunan kapitalın həcmi artmağa başlayır. Ölkəyə daxil olan kapital ixracı iki əsas formada, beynəlxalq kredit formasında (borc kapitalı formasında) və xarici investisiyalar formasında (sahibkar kapitalı formasında) baş verirdi. Xüsusilə, Azərbaycan kapitalın beynəlxalq hərəkəti prosesində iştirak edən bir ölkəyə çevrilir. O cümlədən 1993-1996-cı illərdə respublika iqtisadiyyatında yaranmış iqtisadi tələblər, ciddi maliyyə yatırımlarına ehtiyacın artması mövcud olması makroiqtisadi sabitliyin formalaşmağa başlaması və s. amillər ölkəyə kapital ixrac olunmasına qapı açdı. Azərbaycan iqtisadiyyatına yenidən kapital ixracının formalarından biri xarici investisiya qoyuluşudur. Azərbaycan iqtisadiyyatına xarici investisiya qoyuluşu əsasən əsrin müqaviləsi neft strategiyasının müəyyən olunması ilə bağlı olmuşdur. 1994-cü ildə bağlanan əsrin müqaviləsi isə Azərbaycan iqtisadiyyatında yeni bir dövrün başlanmasına səbəb oldu.

## Əsas hissə

Ölkəmizdə uğurla həyata keçirilən genişmiqyaslı sosial-iqtisadi islahatlar nəticəsində son illər ölkəmizin həyatında olduqca mühüm dəyişiklər baş vermişdir, ölkə iqtisadiyyatı özünün dinamik inkişafı ilə yeni mərhələ olan sənayeləşməyə qədəm qoymuşdur. Təkcə son beş ildə ÜDM istehsalı 29.9%, o cümlədən sənaye məhsulları 2.5 dəfə artmışdır. Göründüyü kimi, ölkə iqtisadiyyatının inkişaf etdirilməsi müəyyən dərəcədə də buraya investisyaların cəlb edilməsi və onlardan səmərəli istifadə olunması günün vacib mərhələlərindən biridir.

Ölkənin investisiya mühitinə bir sıra problemlər mane olur. Ümumiyyətlə investista mühitinə mane olan problemlər FİAS (Xarici İnvestisyalar üzrə Məsləhət Xidməti) tərəfindən 2006-cı ildə aparılan sorgunun nəticəsində daha da aydin görmək olar.

**Qrafik 1. İnvestisiya mühitinə mane olan problemlər**



**Mənbə:** http://www.economy.gov.az

Əlverişli investisiya mühitinə aşağıdakı faktorlar müsbət təsir göstərir [1; s. 14]:

1. Dövlətin sahibkarlığı stimullaşdırılması siyasətinin stabil olması;
2. Güzəştli vergi rejiminin mövcudluğu;
3. Etibarlı operativ bank sistemi;
4. İnformasiya texnologiyası və infrastruktur vasitələri ilə təminatlılıq dərəcəsi;
5. Süni yoxlama və müdaxilənin yoxluğu, göstərilməsi üçün firma şəbəkəsinin inkişafı;
6. İntelektual mülkiyyətin möhkəm müdafiə sistemi;
7. Təsərrüfat fəaliyyəti prosedurasının sadələşdirilməsi;
8. Yaradıcılıq azadlığı və s. (innovativ sərbəstlik);

İnvestisiya mühitinin formalaşdırılması istiqamətində ölkədə kifayət qədər tədbirlər həyata keçirilmişdir. Xarici investisiyaların ölkə iqtisadiyyatına cəlb edilməsi Azərbaycan dövlətinin müəyyən etdiyi iqtisadi inkişaf strategiyasının mühüm tərkib hissəsidir. Son dövrlər ölkədəki siyasi sabitlik və iqtisadi inkişaf xarici dövlətlərin Azərbaycan iqtisadiyyatına uzunmüddətli sərmayə qoymaq üçün marağını daha da artırmışdır. [4; s. 45] Ölkə iqtisadiyyatına qoyulan investisiyalann artımı rəsmi statistik göstəricilərdə də öz əksini tapmışdır. Təsadüfi deyil ki, 1996-2005-ci illər ərzində ölkə iqtisadiyyatına 29,3 milyard ABŞ dollan həcmində investisiya qoyulmuşdursa, 2006-2016-cı illərdə investisiya qoyuluşunun həcmi 203,7 milyard dollar təşkil etmişdir. Bunlardan daxili investisiyalann həcmi 109,3 milyard dollar, xarici investisiyalann həcmi isə 94,4 milyard dollar olmuşdur.

Xarici investisiya fəaliyyətini həyata keçirmək istəyən şirkət müxtəlif məhdudiyyətlərlə qarşılaşa bilər. [2; s. 7]

Ən geniş yayılmış məhdudiyyət ölkəyə gətirilən bəzi əmtələrə (texnologiya və s.) qoyulan vergi və rüsumlardır. Ona görə də belə məhdudiyyətlərin təsirinin yüngülləşdirilməsi məqsədi ilə müvafiq beynəlxalq təşkilatlar mütamadi olaraq, yaranmış şəraitə adekvat tənzimləyici tədbirlər hazırlayırlar. Məs., müasir dövrdə Azərbaycan respublikasında gömrük orqanlarının fəaliyyətinin beynəlxalq standartlara uyğunlaşdırılması, prosedurlarının daha da sadələşdirilməsi və şəffaflaşdırılması məqsədilə Beynəlxalq Valyuta Fondu, Ümumdünya Gömrük Təşkilatı ilə birgə proqram həyata keçirilməkdədir. Aparılan sistamatik fəaliyyətin nəticəsi kimi, beynəlxalq təcrübəyə müvafiq olaraq demek olar ki, ölkəmizdə ixrac rüsumları ləğv edilmiş, idxal rüsumlarının isə 15%-lik maksimal həddi müəyyənləşdirilmişdir. [4; s. 5]

Ölkədə investisiya mühitinin daha da yaxşılaşdırılması, sahibkarlıq fəaliyyətinin genişləndirilməsi üçün müvafiq innovasiya strukturlarının, biznes-inkubatorlann, texnoparklann yaradılması sahəsində əhəmiyyətli işlər görülmüşdür. 2013-cü ildən başlayaraq, "Azərbaycanda büdcəyə dəstək proqramlarının əlaqələndirilməsi və tətbiqinə dəstək layihəsi"nin icrasına başlanmışdır. Layihə çərçivəsində Azərbaycanda biznes inkubatorlannm inkişaf etdirilməsi, bu sahədə atılan addımlann və fəaliyyətin əlaqələndirilməsi, habelə biznes inkubatorlarının inkişafında Avropa İttifaqının qabaqcıl təcrübəsinin ölkədə tətbiqi istiqamətində müvafiq tədbirlərin həyata keçirilməsi nəzərdə tutulur. Biznes inkubatorlarının yaradılması ilə ölkəmizdə sahibkarlığa göstərilən dövlət dəstəyi, biznes və investisiya mühitinin daha da yaxşılaşdırılması tədbirləri davam etdiriləcək, innovativ və perspektivli biznes sahələrinin inkişafına nail olunacaqdır.

## Nəticə

"2018-ci ilin dövlət büdcəsinin icrası haqqında" qanun layihəsinə görə, 2017-ci il dövlət büdcəsinin gəlirləri 16 516 684 min manat, 2018-ci ildə isə bu rəqəm 5 992 185,7 min manat çox, yəni 22 508 869,7 min manat olub. 2017-ci il dövlət büdcəsinin xərcləri 17 594 748 min manat, 2018-ci ildə isə bu rəqəm 5 137 166,5 min manat çox, yəni 22 731 644,5 min manat olub. 2018-ci ildə büdcə kəsiri 951 milyon manat proqnozlaşdırılsa da, büdcənin icrası zamanı kəsir 222 milyon 774,8 min manat olub. Bu, 2017-ci ildəki büdcə kəsrindən 5 dəfəyə qədər azdır. [6] Bütün bu göstəricilər ölkə iqtisadiyyatına qoyulan insvestisiyaların nəticəsidir.

Müasir şəraitdə Azərbaycan Respublikasında investisiya mühitinin formalaşdırılması, innovasiya strukturlarının təşkili, kiçik biznesin inkişafının təmin edilməsi üçün təxirəsalınmaz hazırlıq işlərini aşağıdakı kimi ümumiləşdirmək olar:

– istehsal və ətraf mühitin mühafizəsi təyinatlı kiçik biznesin inkişafının həvəsləndirilməsi məqsədilə xüsusi proqramlann işlənib hazırlanması və müvafiq fondlann yaradılması;

– istehsal birliklərinin, şirkətlərin, səhmdar cəmiyyətlərinin, elmi-tədqiqat mərkəzlərinin və universitetlərin iştirakı ilə dövlət tərəfindən biznes inkubatorlannm və texniki parkların yaradılmasının daha da genişləndirilməsi;

– müxtəlif mənbələrdən maliyyələşdirilən və təsərrüfat hesabı əsasında fəaliyyət göstərən konsaltinq, audit və treninq üzrə məsləhət firmalarının yaradılması;

– innovativ və yüksək texnologiyalar əsasında rəqabətqabliyyətli sənaye istehsalının inkişafı, xidmətlərin göstərilməsi üçün münbit şəraitin yaradılması və bu sahədə sahibkarlığın dəstəklənməsi;

– iqtisadiyyatın, o cümlədən qeyri-neft sektorunun davamlı inkişafının təmin edilməsi;

**Ədəbiyyat**

1. Azizova G.A. "Dövlətin investisiya-innovasiya siyasəti", Bakı, Elm, 2012, 234 s.
2. Əhmədov G.Ə. "İnnovasiya sahibkarlığı", Azərbaycan, Aqrar Elm jurnalı, 2010, 7 s.
3. Əliyev R.B., Novruzov N.A., Məmmədov M.A. "İnvestisiyanın maliyyələşdirilməsi və
4. kreditləşdirilməsi", Bakı, 2003, 425 s.
5. Zeynalov V.Z. "Azərbaycanda investisiya siyasəti", Bakı, Sabah, 2012, 265 s.
6. Aslanzadə İ.A. "İnvestisiya layihələrinin təşkili və idarə olunması", Bakı, 2000, Maarif, 132 s.
7. http://www.economy.gov.az
8. https://sputnik.az/economy/20190521/420471579/zitad-semedzade-investisiya-qoyulushu.html

**Directions for formation of favorable investment climate in Azerbaijan**

**Summary**

The purpose of the study-To study the directions of formation of favorable investment climate in Azerbaijan.

Research methodology-The research database includes monographs on the subject, official site information, statistical collections of the State Statistical Committee, etc. contane. Systematic approach, comparison, analysis methods were used in the study.

Research results - Investment is perceived as an integral part of the modern economy. In developed economies, the share of investment in GDP is hesitant from 50% to 45%. In this regard, the economic growth of each country is determined by the specific weight of the funds allocated for investment. The Azerbaijani economy has shown dynamic growth, despite accidents in the world. 17.2 billion manat was invested in the country last year, which is up to 3 billion manat compared to 2017. 60-70% of the investment comes from domestic resources.

Practical significance of research-Improvement of the favorable investment climate in Azerbaijan has a powerful impact on the development of the country's economy.

**Направления формирования благоприятного инвестиционного климата в Азербайджане**

**Резюме**

Цель исследования-изучить направления формирования благоприятного инвестиционного климата в Азербайджане.

Методология исследования-База данных исследования включает монографии по теме, информацию об официальном сайте, статистические сборники Госкомстата и т. Д. contane. В исследовании использовался системный подход, сравнение, методы анализа.

Результаты исследования - инвестиции воспринимаются как неотъемлемая часть современной экономики. В развитых странах доля инвестиций в ВВП оценивается от 50% до 45%. В связи с этим экономический рост каждой страны определяется удельным весом средств, выделяемых на инвестиции. Экономика Азербайджана демонстрирует динамичный рост, несмотря на аварии в мире. В прошлом году в страну было инвестировано 17,2 миллиарда манатов, что по сравнению с 2017 годом составляет до 3 миллиардов манатов. 60-70% инвестиций поступают из внутренних ресурсов.

Практическая значимость исследований - Улучшение благоприятного инвестиционного климата в Азербайджане оказывает мощное влияние на развитие экономики.

**Rəyçi: M.Y. Quliyev**

**Məqalə tarixçəsi**

Göndərilib: 13 yanvar 2020 Qəbul edilib: 21 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/54-58

**Elçin Fərhad oğlu Osmanov**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
osman.elchin@gmail.com

# BİZNESİN STRATEJİ İDARƏ EDİLMƏSİNDƏ İNNOVASİYA LAYİHƏLƏRİNİN İQTİSADİ SƏMƏRƏLİLİYİNİN ARTIRILMASININ ƏHƏMİYYƏTİ

***Açar sözlər:*** *innovasiya, biznes, sahibkarlıq, idarəetmə*
***Key words:*** *innovation, business, entrepreneurship, management*
***Ключевые слова:*** *инновации, бизнес, предпринимательство, менеджмент*

## Giriş

Müasir biznes sahəsində elmi və texniki nailiyyətlərin savadlı və düzgün tətbiqini nəzərdə tutan innovasiya sistemi sürətlə inkişaf edir. Bu inkişafda biznes inkubatorlar da mühüm rol oynayırlar. Belə ki, biznesinkubatorların əsas vəzifəsi maraqlı biznes ideyanı aşkara çıxarmaq və onun biznes layihəsinə çevrilməsinə kömək etmək, məhsul istehsalına yardım göstərmək və bazara çıxışı təmin etməkdən ibarətdir. Bütün bu vəzifələrin yerinə yetirilməsinə, xüsusilə məhsulun bazara çıxışına yardım göstərmək kifayət qədər mürəkkəb məsələdir. Buna nəinki, ölkə daxilində, eləcə də beynəlxalq aləmdə düzgün biznes siyasəti aparmaqla, biznes infrastrukturunun işlək mexanizmlərini hərəkətə gətirməklə nail olmaq mümkündür. Bu funksiya getdikcə daha vacib əhəmiyyət kəsb edir, çünki vaxt keçdikcə yeni müəssisənin bazara çıxışı tədricən artmaqda olan rəqabət üzündən mürəkkəb xarakter almaqdadır. Biznesin inkubasiyası uzunmüddətli dövrə hesablanmış sahibkarlığa köməyin infrastruktur mexanizmlərindən biri sayılır.

Ölkəmizdə və onun ayrı-ayrı regionlarında biznes-inkubatorların bu funksiyası yerli müəssisələrin daxili və xarici bazarlara çıxışı zamanı rəqabətin güclənməsi səbəbindən mürəkkəb vəziyyətin yaranması ilə əlaqədar daha vacib əhəmiyyət kəsb edir.

Beləliklə, innovasiya biznesi müxtəlif sahələrdə yeniliklərin, yeni qaydaların yaradılması və təcrübədə istifadə edilməsi prosesidir. Sənaye müəssisələrinin elmitexniki tərəqqinin son nailiyyətləri əsasında modernləşdirilməsi, mütərəqqi texnologiyaların tətbiqi, bazarda amansız rəqabətə davam gətirə bilən yüksək keyfiyyətli məhsul istehsalının artırılması innovasiya biznesinin inkişafından daha çox asılıdır.

## Əsas hissə

Biznesdə rəqabətə davam gətirmək və hazırkı çətinlikləri aradan qaldırmaqla inkişafa can atmaq meylləri müəssisəni onun qarşısında duran problemlərin sürətli və məhsuldar həllinə kömək edən yeni idarəetmə alətlərinin axtarışına və fəal istifadəsinə məcbur edir. Bu günkü şəraitdə yeni səmərəli alətlərindən biri kimi məhz reinjinirinq özünü dogrultmaqdadır. Reinjinirinq konsepsiyasına əsasən təşkilatın ətraf mühitin dəyişməsinə vaxtında reaksiya göstərməsi mütləqdir. Bu müəssisənin gələcəyini dəqiq görməsini və reinjinirinq menecerinin bütün mərhələlərdə qrupun işində bilavasitə istirakını nəzərdə tutur. Bu cür yanaşmada müştərilərin tələbatının ödənilməsi və rəqiblərin fəaliyyətinin nəzərə alınması strategiyası sərt şəkildə daxili dəyişikliklər strategiyasına uyğunlaşdırılır.

Biznes fəaliyyətinin həyata keçirilməsi zamanı risklərin təzahür etməsinin obyektiv səbəbləri mövcuddur. Nəzərdə tutulmuş fəaliyyətin həyata keçirilməsi prosesi bir çox amillərdən ibarətdir. Buna görə də sahibkar firmanın həyat dövrünün (tsiklinin) bütün mərhələlərində itkiyə məruz qala bilər. Biznesdə riskin meydana çıxması, sahibkarların iqtisadi azadlığının əks tərəfi, onun üçün özünəməxsus ödənişdir. Bazar münasibətləri inkişaf etdikcə qeyri-müəyyənlik və sahibkarlıq riski artır. Biznesdə hazırkı və gələcək qeyri-müəyyənliyi aradan qaldırmaq çox çətindir. Qeyri-müəyyənlik obyektiv həqiqətin bir elementi kimi çıxış edir, buna görə də risk istənilən sferadakı sahibkarlığa xas xüsusiyyətdir [2, s.36].

Nəzərdə tutulmuş son nəticələrə (mənfəət, gəlir) nail olmaq üçün əvvəlcədən planlaşdırılmış xərclərdən çox gözlənilməz xərclərin ortaya çıxması risk adlanır. Risk müəyyən zaman kəsiyində biznes fəaliyyətinin həyata keçirilməsindəki qeyri-müəyyənlik anlayışı ilə əlaqədardır. İnnovasiya layihələrinin müxtəlif riskləri vardır. İnnovasiya layihəsində risklərin idarəedilməsi metodologiyasının mürəkkəblik səviyyəsi və vacibliyi, xüsusilə də, onların ölçüsü sənaye müəssisələri ilə müqayisdə xeyli yüksəkdir. Layihə üzrə qoyulan məsələlər fundamental elmi nəzəriyyələrə əsaslandığından, bu sahə də mövcud olan nəzəri müddəalar, prinsiplər, metod və metodologiyalar tədqiq olunaraq yeni iqtisadiyyatın formalaşması proseslərinə tətbiq olunur və həmin istiqamətdə tövsiyələr verilir.

Məhsul və xidmətlərin istehsalı ilə məşğul olan sahibkarlıq fəaliyyətində risklər məhsulların istehsalına çəkilən xərclərin nəzərə alınması və onların reallaşdırılması zamanı əldə olunacaq mənfəətin hesablanması nöqteyi-nəzərindən mühüm əhəmiyyət kəsb edir. Bu zaman risklərə iki nöqteyi-nəzərdən baxmaq mümkündür:

1. istehsala çəkilən xərclər. Bu zaman xərclərin artım riski, xammalın qiyməti, işçilərin əməkhaqqı ilə bağlı xərclərinin nəzərə alınması zamanı risklərin müəyyən edilməsi vacibdir.
2. müştərilər, alıcılar nöqteyi-nəzərindən. Bu zaman məhsul və ya xidmətin reallaşdırılması nəticəsində əldə ediləcək gəlirin hesablanması və məhsulun həyat dövrü bitməmiş yeni məhsulun bazara çıxarılması üçün qabaqlayıcı tədbirlərin həyata keçirilməsi baxımından zəruridir.

İnnovasiyada riskin qiymətləndirilməsinin özünün xüsusiyyətləri və imkanları, həm də bazarın perspektivləri, ümumiyyətlə əsas hadisələrin identifikasiyası və hadisələrin mümkün inkişafı ssenarisinin qurulması kimi həyata keçirilir. Bu əlaqə barədə,əlbəttə, "korporativ biznesdə strateji risklər" və onların idarəedilməsi haqqında danışmaq olar, lakin çətin ki, təhlil və planlaşdırmanın dəqiq ədədi metodları şirkətin menecerlərin hansısa yeni və səmərəli idarəetmə alətlərini verəcəklərin ümid etmək lazımdır. Bəzən onların köməyilə idarəetmə qəraralarının qəbulu zamanı rahat istifadə edə biləcəyimiz faydalı informasiya almaq olar ki, bu da başqa məsələdir: Məsələn, bazarda hadisələrin inkişaf ssenarisinin ehtimalı əsasında ənənəvi SWOT-təhlilini tənzimləmək və ya onların ehtimallarına görə biznesdə xarici təhlükələrə qarşı prioritetlər yaratmaq və ya beynəlxalq kapital bazarlarının təhlili əsasında Azərbaycan bazarının müvafiq seqmentlərində hadisələrin inkişafını proqnozlaşdırmağa cəhd etmək. Korporativ biznesdə vəzifələrin yaradılması və mədəni təhlil mənasında risklərin idarə edilməsi metodologiyası özü faydalı ola bilər [5, s. 59].

Biznesdə innovasiya proseslərinin inkişafı üçün zəruri şərtlər üç əsas istiqamətdə formalaşır:

1. Dövlət köməyi
2. Sahibkarlıq strukturunun daxili şərtləri
3. Xarici şərtlər

Biznesdə innovasiya proseslərinin inkişafı üçün mövcud sahibkarlıq strukturunun daxili şərtləri aşağıdakı sxemdə ifadə olumuşdur.

**Sxem 1: Biznesdə innovasiya proseslərinin inkişafı üçün sahibkarlıq strukturunun daxili şərtləri**




Biznesdə innovasiya proseslərinin inkişafı üçün dövlət köməyinin iki əsas istiqaməti: birbaşa və dolayı istiqamətləri aşağıdakı sxemdə verilmişdir:

Biznesdə innovasiya proseslərinin inkişafı üçün xarici şərtlər ilk növbədə innovasiya infrastrukturunun formalaşmdırılması istiqamətləri ilə bağlıdır. Həmin istiqamətlərə aşağıdakılar aiddir:

– elmi-istehsal və tədris mərkəzləri sistemlərinin(texnoparklar, texnopolislər, inkubatorlar və s.) yaradılması;

– innovasiya xidmətləri(texnologiya marketinqi, injinirinq, konsaltinq, texnoloji audit və s.) sferasının inkişafı;

– innovasiya proseslərinin informasiya təminatının avtomatlaşdırılmış sisteminin yaradılması;

– investisiyanın effektiv sığortalanma mexanizminin formalaşdırılması.

**Sxem 2: Biznesdə innovasiya proseslərinin inkişafına dövlət köməyi**




İqtisadi ədəbiyyatda, eləcə də innovasiya fəaliyyətini tənzimləyən qanunvericilik aktlarında innovasiya yönümlü inkişaf haqqında xeyli həcmdə tədqiqatların mövcudluğuna baxmayaraq, innovasiya, innovasiya potensialı, innovasiya inkişafı, texnologiya transferi kimi anlayışların vahid şərhinə rast gəlinmir. Bu anlayışlara müxtəlif iqtisadi sistemlər üçün müxtəlif alimlər tərəfindən müxtəlif aspektlərdən yanaşılır [4, s. 28].

"İnnovasiya" terminінə təkcə innovasiya fəaliyyətinin son nəticəsi (yeni məhsul, yeni texnika və ya texnologiyanın mənimsənilməsi, təşkilati və idarəetmə metodlarının yaxşılaşdırılması) kimi deyil, həm də iqtisadi sistemin dayanıqlı inkişafına kömək edən və yeniliyin rəqabətqabiliyyətli məhsula transformasiyasına əsaslanan ən vacib iqtisadi artım amili kimi yanaşmalıdır. İnnovasiya potensialına maliyyə-iqtisadi və intellektual resursların mövcudluğu, habelə iqtisadi sistemin uğurlu innovasiya fəaliyyətinə hazırlıq səviyyəsini müəyyən edən hüquqi, təşkilati-idarəetmə, maddi-texniki, sosial və informasiya amillərinin məcmusu daxildir.

## Nəticə

Bazar iqtisadiyyatında rəqabət mübarizəsinin üsullarından birinə çevrilən innovasiyanın başlıca nəticəsi əmək məhsuldarlığını artırmaq və mənfəəti yüksəltməkdən ibarətdir. Yəni innovasiya, sadəcə, iqtisadi artım sürətinin artırılması baxımından deyil, həm də iqtisadi inkişafın istiqamətinin dəyişdirilməsi və həyat standartları səviyyəsinin yaxşılaşdırılması baxımından böyük əhəmiyyət kəsb edir. Bazar münasibətləri şəraitində elmi-texniki potensialdan səmərəli istifadə etməklə, iqtisadiyyatda innovasiyalara əsaslanan inkişaf istiqamətlərinin müəyyən edilməsi aktual problemlərdən biridir. İnnovasiyaların yaradılması spesifik xüsusiyyətə malik biliklər tələb edir. Əslində, intellektual potensialın cəmiyyətdə miqyası daha genişdir. Bu da onu elmi-texniki potensialdan fərqləndirən əsas cəhətdir. Çünki intellektual potensial cəmiyyətin intellekt səviyyəsini səciyyələndirir və bütövlükdə təhsil səviyyəsinin əsas göstəricisi hesab olunur. Elmi-texniki potensial isə cəmiyyətdə sosial-iqtisadi inkişafa nail olunması üçün elmi-tədqiqat işlərinin aparılması, tətbiqi, təcrübədən keçirilməsi və s. proseslərdə bilavasitə iştirak edən resurslarla səciyyələndirilir. Qeyd olunan məqamların spesifik xüsusiyyətləri hər bir ölkədə bu və ya digər formada təzahür edən münasibətlər sistemi ilə müəyyənləşdirilir, bu isə milli innovasiya sistemi kimi xarakterizə edilir.

Ölkədə innovasiya fəaliyyətinin sürətlənməsi və davamlı iqtisadi inkişafa nail olunması üçün bir sıra tədbirlərin görülməsi vacibdir ki, onlara da aşağıdakılar aid edilə bilər: milli rəqabət qabiliyyətli məhsul istehsalına yönəldilmiş innovasiya fəaliyyətinin stimullaşdırılması; insan kapitalının formalaşmasına təkan verən təhsil, ixtisas və peşə sahəsində müvafiq siyasətin aparılması; innovasiya fəaliyyəti ilə bağlı olan büdcə-vergi tənzimlənməsinin mütəmadi qaydada həyata keçirilməsi; kiçik innovasiya sahibkarlığı üçün xüsusi güzəştli vergi sisteminin tətbiq olunması; innovasiya sferasının davamlı maliyyə təminatının həyata keçirilməsi və s. Bu istiqamətlərin hər birinin ayrı-ayrılıqda deyil, sistem şəklində həyata keçirilməsi innovasiyanın inkişafına, milli iqtisadiyyatın müvazinətli fəaliyyət göstərməsinə səbəb ola bilər. Ümumilikdə, innovasiya fəaliyyətinin dövlət tənzimlənməsinin məqsədi iqtisadiyyatın bütünlükdə normal fəaliyyət göstərməsini təmin edən şəraitin yaradılması və sahibkarların beynəlxalq əmək bölgüsündə sabit iştirak edərək, optimal səmərə əldə etməsidir.

## Ədəbiyyat

1. Əliyev M.Ə “Biznesin təşkili və idarə edilməsi” Baki 2010
2. Əzizova G. Dövlətin investisiya-innovasiya siyasəti. Bakı : – İqtisad Universiteti‖ nəşriyyatı, 2012.
3. Gauntlett D.A. Insurance Coverage of Intellectual Property Assets, CCH Incorporated, 2013, 1512 p.
4. Kazımlı X.H, Quliyev İ.O ”İqtisadi risklərin qiymətləndirilməsi və idarə edilməsi” Bakı 2011
5. Qasımov F.H, Əliyev T.N Milli innovasiya sisteminin təşkili və idarə edilməsi.Elm və Təhsil-Bakı 2013.
6. Manafov Q.N “Sahibkarlıq nəzəriyyəsi” Bakı 2011
7. Şiryayev V.İ., Şiryayev Y.V “Biznes prosesləri idarəetmə” Bakı 2013

## The Importance Of Increasing The Economic Efficiency Of Innovation Projects In Strategic Business Management

### Summary

Business innovation is an organization's process for introducing new ideas, workflows, methodologies, services or products. İnnovation which calls for using technology in new ways to create a more efficient organization, business innovation should enable the achievement of goals across the entire organization, with sights set on accomplishing core business aims and initiatives. Innovation often begins with idea generation, wherein ideas are narrowed down during brainstorming sessions after which leaders consider the business viability, feasibility and desirability of each idea. In article analyzed essence, features and structure efficiency economic systems and factors influencing it. Are described methodical approaches to an estimation of efficiency of activity of innovative structures, including ICT-technoparks.

## Важность повышения экономической эффективности инновационных проектов в стратегическом управлении бизнесом

### Резюме

Бизнес-инновации – это процесс организации для внедрения новых идей, рабочих процессов, методологий, услуг или продуктов. Инновации, которые требуют использования технологий новыми способами для создания более эффективной организации, бизнес-инновации должны обеспечивать достижение целей во всей организации с ориентацией на достижение основных бизнес-целей и инициатив. Инновации часто начинаются с генерации идей, когда идеи сужаются во время мозгового штурма, после которого лидеры рассматривают жизнеспособность бизнеса, осуществимость и

желательность каждой идеи. В статье проанализированы сущность, особенности и структура эффективности экономических систем и факторов, влияющих на нее. Описаны методические подходы к оценке эффективности деятельности инновационных структур, в том числе ИКТ-технопарков.

**Rəyçi: dos. S.Ş.Qurbanova**

**Məqalə tarixçəsi**
Göndərilib: 13 yanvar 2020 Qəbul edilib: 18 yanvar 2020

# PEDAQOGİKA PEDAQOGY ПЕДАГОГИКА

DOI: 10.36719/AEM/2007-2020/50/59-62
**Эллада Муса гызы Кулиева**
Бакинский славянский университет

## ПУТИ ПОВЫШЕНИЯ КВАЛИФИКАЦИИ УЧИТЕЛЯ В ЗАРУБЕЖНЫХ СТРАНАХ

***Ключевые слова:*** *модернизация образования, повышение квалификации, дополнительное образование, самообразование, наставничество, тренинг, микрообучение, аттестация, технология*
**Key words:** *modernization of education, advanced training, additional education, self-education, mentoring, training, micro-education, certification, technology*
***Açar sözlər:*** *təhsilin modernləşdirilməsi, qabaqcıl təlim, əlavə təhsil, özünü təhsil, mentorluq, təlim, mikro təhsil, attestasiya, texnologiya*

Модернизация современного педагогического образования в условиях современности является важным условием его дальнейшего успешного развития на рынке образовательных услуг. Как известно, именно педагогу принадлежит особая роль в качественном развитии современного образования и социокультурной модернизации страны в целом. Новые условия предлагают обновления содержания, организационных форм и методов обучения в вузе, перехода от дисциплинарного подхода к междисциплинарности и комплексности образования, подготовку педагога не только предметника, но и носителя социально и профессионально значимых качеств.

Современные условия предусматривают совершенствования деятельности и институтов послевузовского педагогического образования, так как непрерывность профессионального образования педагога является предпосылкой развития его творческих способностей и индивидуального педагогического опыта. Повышение квалификации как вид дополнительного профессионального образования направлено на освоение новых общетеоретических знаний, совершенствование профессиональных умений и навыков, освоение передового опыта, адаптацию учителей к динамично изменяющемуся содержанию их труда, формированию готовности к выполнению трудовых функций.

Установка на повышение квалификации как ступень непрерывного образования должна приобрести для учителя статус личностно значимой ценности, побуждающей его к усвоению новых знаний и умения их использовать в практической деятельности. Интерес к повышению квалификации и профессиональной переподготовки взрослых возрос во второй половине XX века. В 1970 г. в материалах Юнеско впервые был поставлен вопрос о непрерывном повышении квалификации специалистов и сформулированы принципы непрерывности образования. В странах Западной Европы, США деятельность по повышению квалификации специалистов первоначально была сосредоточена непосредственно в фирмах, компаниях, консультационных центрах и пр., которые определяли уровень их профессиональной подготовки. Ныне повышение квалификации в зарубежных странах стимулируется аттестациями специалистов, однако в большинстве стран нет стандарта повышения квалификации, за исключением Франции, Италии, Испании, цель которых заключается в контролировании общенациональных стандартов при повышении квалификации специалистов. Так, в США в середине 90-х годов в системе повышения квалификации учителей был распространен персонологический подход, использовались теоретические ориентации. Ряд исследователей при этом, ориентируясь на теоретической ориентации обучения в системе повышения квалификации, акцентировали внимание на изучении психосоциального развития личности на разных этапах его жизни (Дж.Левинджер, Э.Эриксон, Ж.Пиаже и др.).

Дж.Левинджер выделял 10 психосоциальных стадий развития, в ходе которых личность адаптируется к внешней среде, совершенствуется, повышается при этом его интеллектуальное и моральное развитие, возрастает способность к самосовершенствованию. Американским исследователем Л.Спринтоном были также разработаны различные программы повышения квалификации учителей. Он считал, что эффективное психологическое вмешательство может стимулировать переход индивида на более высокие стадии психосоциального развития. При этом он отстаивал связь теории с практической деятельностью учителей в школах, помощь квалифицированных наставников, использование как методов обучения - ролевой игры, создание дискуссионных ситуаций, анализа, самоанализа т пр.

Л.Спринтон считал, что в ходе обучения учителя должны быть ознакомлены с целями обучения, с основами коммуникативной культуры, участвовать в лабораторных работах, в моделировании ситуаций максимально приближенных к условиям школьной среды. Завершаться работа должна практикумом в школе (2).

Как в странах Западной Европы, так и в США в условиях современности значительное внимание отводится интенсификация повышения квалификации. В системе повышения квалификации специалистов используют: опытное обучение и умение учиться, критическое рассуждение и самообразование.

Так, в США распространенной формой повышения квалификации являются краткосрочные курсы со сроком обучения от двух недель до двух-трех месяцев с отрывом от производства, в целях повышения квалификации широко используют и самообразование. В большинстве штатов США учителя через каждые пять лет проходят аттестацию и за этот период они должны набрать определенное число кредитов, т.е. часов занятий в системе повышении квалификации. При этом учитель имеет право выбрать занятия в университетах, на курсах местных отделов образования, в исследовательских институтах. Кредиты они получают и за участие в конференциях, публикации журнальных статей. Такая система повышения квалификации содействует повышению творческих возможностей учителей, при этом лучшие получают ранг «вдохновитель», т.е. право на сокращенную учебную нагрузку и надбавку к заработной плате (3).

В США для учителей организуются и послеуниверситетские тренинги, а для начинающих учителей создается институт наставничества, в ходе которого опытные учителя оказывают посильную помощь начинающим коллегам. Послеуниверситетская подготовка предполагает две модели наставничества: формализованный и гуманистически ориентированный. Обе модели предусматривают определенный состав наблюдателей (кураторов), куда входят: учитель-наставник, директор школы, представитель высшего образования. В первой модели деятельность наставника, его профессиональный стиль служит образцом для молодого педагога, напоминает ученическую модель педагогического образования. Однако в последние годы в США широкое распространение получает неформализованное гуманистически ориентированное наставничество, которое ведет к отказу от нормативно-оценочной позиции, не предусматривает систематического посещения занятий начинающих педагогов куратором, выполнения ими тренинговых программ и пр., а предусматривает субъект-субъективное взаимодействие наставника и новичка, что в большей степени стимулирует их активность и инициативу (4).

Современные программы повышения квалификации педагогических кадров в странах Западной Европы предусматривают интеграцию учебной и профессионально-педагогической деятельности, демократизацию управления учебным процессом.

Повышение квалификации учителей осуществляется как на базе конкретных школ, где учитель может быть максимально интегрирован в школьную среду, так и во внешкольных учреждениях – курсах на базе университетов, семинарах и пр. Исследователи В.Д.Холи, И.Л.Валли считают, что работа над групповыми проектами, участие в коллективной опытно-экспериментальной работе в школе считается наилучшим способом повышения квалификации, так как сотрудничество профессионально обогащает каждого участника работы и содействует повышению качества образования. В процессе повышения квалификации учителей систематически осуществляется оценка его качества деятельности специалистами, администрацией школы, экспертами как с точки зрения усвоенных методик преподавания, так и учебных достижений учащихся школы. Данная система подготовки кадров учителей направлена на развитие школьной среды, так как школа оказывается вписанной в формулу интересов образовательных программ.

Реализация данной формы повышения квалификации педагогических кадров позволяет связать теорию с практикой, личные и коллективные потребности, совместно решать общие проблемы, повысить качество образования (5).

Изучение зарубежного опыта показывает, что профессиональному росту начинающих учителей в большей степени содействует помощь опытных наставников в школах, непосредственно на рабочем месте.

Так в Англии для молодых специалистов вводится практика «вводного года», в процессе которого за счёт снижения преподавательской нагрузки он имеет возможность заняться самообразованием (6).

Курсы повышения квалификации в Англии осуществляет Департамент образования и науки, институты педагогики при университетах, независимые консультационные центры, местные органы образования, учительские центры и школы.

В Германии повышение квалификации осуществляется на трех уровнях: земельном, региональном и муниципальном. Центральной структурой в повышении квалификации является земельный институт повышения квалификации. В Германии функционируют как долгосрочные, так и краткосрочные курсы. Повышение квалификации является обязанностью каждого учителя, в школах данная работа планируется и проводится в рамках школьной программы. Учитель-стажер в Германии участвует в работе образовательного семинара, изучает предметную дидактику, нарабатывает профессионально-педагогические навыки в школе. Современные немецкие исследователи - А.Шмут, Р.Миллер, Х.Зиберт и др. в системе повышения квалификации учителей отстаивают широкое применение наставничества, тренингов, семинаров и диалогов.

Во Франции основная роль в системе повышения квалификации принадлежит Академическим миссиям по переподготовке работников системы национального образования, которые организуют курсы повышения квалификации для работников системы образования. Система повышения квалификации учителей во Франции направлена на совершенствование профессионального и общекультурного уровня учителей, обновление знаний. Академические миссии, летние университеты, краткосрочные стажировки, организуемые для педагогов и руководителей всех типов школ, обеспечивают непрерывность процесса совершенствования педагогического персонала в период их профессиональной деятельности.

В Японии аттестация педагогического персонала предусматривает обязательное повышение квалификации каждые пять лет и соответственно повышение их заработной платы. В зарубежных странах при повышении квалификации педагогических работников широко применяется микрообучение.

Широкое распространение в системе повышения квалификации на современном этапе получает дистанционное обучение, инновационные методы обучения, игровые технологии, модульный принцип освоения программ обучения, работа в команде и пр.

Программа повышения квалификации дает возможность изучат психолого-педагогические проблемы, ознакомиться с передовым опытом учителей, современными технологиями обучения и воспитания.

Широко используются и традиционные организационные формы обучения:

- лекции включают слушателей в процессе размышления над путями использования теоретического материала в практической деятельности;
- семинарские занятия содействуют развитию практических умений и опыта творческой деятельности;
- практические занятия формируют опережающие умения и навыки, направленные на развитие творческой направленности педагогической деятельности.

В системе повышения квалификации наряду с интерактивными технологиями используется групповая работа, технологии создания «моделей деятельности», «мозговой штурм», которые содействуют активизации познавательных возможностей обучаемых.

Широко используется создание конфликтных ситуаций и совместное решение проблем, моделирование ситуаций, максимально приближенных к школьной жизни.

Современные условия требуют постоянного обновления педагогических знаний, творческого характера педагогической деятельности, обеспечения учителя необходимыми знаниями и умениями для успешной профессионально-педагогической деятельности.

## Литература

1. Зарубежный опыт последипломного образования. Под ред. Никандрова О.М. СПб, 1992.
2. Гаргай В.Г. США: персонологический подход в повышении квалификации учителей. // Педагогика, 1993 № 1
3. Жуковский И.В. Центры педагогической информации Франции. // Педагогика, 2002 № 6
4. Шиян О.Я, Послеуниверситетский тренинг учителей США: новые ориентиры. // Педагогика, 1996 № 1
5. Гаргай В.Г. Повышение квалификации учителей на Западе: новые подходы. // Педагогика, 2003 № 2.
6. Жур. Вопросы образования, № 2008 № 3

## Xarici ölkələrdə ixtisaslı müəllim hazırlığı yolları

### Xülasə

Məqalədə ABŞ və Qərbi Avropada ali təhsildən sonrakı pedaqoji təhsil institutlarının fəaliyyətinin təkmilləşdirilməsi məsələləri araşdırılır. Qeyd olunur ki, əlavə peşə təhsili növü kimi qabaqcıl təlim yeni ümumi nəzəri biliklərin mənimsənilməsinə, müəllimlərin peşə bacarıqlarının artırılmasına, qabaqcıl təcrübənin mənimsənilməsinə və praktik fəaliyyətdə istifadə olunmasına, dəyişən iş şəraitinə uyğunlaşdırılmasına yönəldilib.

**Ways of teacher training in foreign countries**

**Summary**

The article discusses the issues of improving the activities of postgraduate teacher education institutions in the United States and Western Europe. It is noted that advanced training as a type of additional professional education is aimed at mastering new general theoretical knowledge, improving professional skills of teachers, mastering advanced experience and using it in practical activities, adapting them to changing working conditions.

**Рецензент: доц. З.Меджидова**

**Məqalə tarixçəsi**
Göndərilib: 21 yanvar 2020 Qəbul edilib: 24 yanvar 2020

DOI: 10.36719/AEM/2007-2020/50/63-66
**Səlbi Ağamehdi qızı Abbasova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
s-asadzade@mail.ru

# SPASTİK DİPLEGİYA DİAQNOZLU UŞAQLARIN NEYROPSİXOLOJİ TƏDQİQİ

***Açar sözlər:*** *neyropsixoloji, qnostik funksiyalar, praksis, psixi funksiyalar, serebral iflic, spastik diplegiya*
***Key words:*** *neuropsychological, gnostic functions, praxis, cerebral palsy, spastic diplegia*
***Ключевые слова:*** *нейропсихологическая, гностические функции, праксис, церебральный паралич, спастическая диплегия*

Məktəb yaşlı serebral iflicli uşaqlarda ali psixi funksiyaların neyropsixoloji təhlili onların təhsili və korreksiya – inkişafetdirici prosesdə psixoloji-pedaqoji müşayəti üçün fərdi proqramların işlənilməsinə imkan verir.

Tədqiqatlar psixometrik (Veksler metodikasının uşaq variantı ilə müayinə) və neyropsixoloji olmaqla əsas iki istiqamətdə aparılmışdı. Bu istiqamətlər aşağıdakı bloklardan təşkil olunmuşdu:

1) qnostik funksiyaların tədqiqi: görmə (əşyaların və onların təsvirlərinin tanınması), eşitmə (ritmlərin və ayrıca fonemlərin təkrarlanması), qnozis;

2) praksis funksiyaların tədqiqi: konstruktiv, kinestetik praksis;

3) əqli iş bacarığının tədqiqi: eşitmə və görmə modallığında yaddaşın, diqqətin (həcm, konsentrasiya, keçid, iradilik);

4) fikri proseslərin keyfiyyət təhlili: ümumiləşdirmə, əqli nəticə;

5) qrafik bacarıqların tədqiqi: rəsmlər, hərf və rəqəmlərin yazılışı

Əldə olunmuş empirik məlumat aşağıdakı sxemlə təhlil olunmuşdu:

3 bal - tapşırığın səhvsiz yerinə yetirilməsi;

2 bal - tapşırığın yerinə yetirilmə sürəti ilə əlaqədar kobud olmayan
səhvlər, uşağın özü tərəfindən aşkar edilərək müstəqil düzəldilir;

1 bal - kobud səhvlər

Kəmiyyət qiymətləndirilməsi aşağıdakı kimi aparılmışdı:

а) tapşırığın yerinə yetirilməsi üçün orta balın hesablanması;

б) əldə olunmuş qiymətlər faizə çevrilərək tapşırığın yerinə yetirilməsinin müvəffəqiyyət əmsalının çıxarılması (MƏ);

в) hər proba üçün orta MƏ hesablanması.

Səhvlərin keyfiyyət təhlilinə uşağın fəaliyyətinin dinamik və zaman parametrləri, buraxılmış səhvlərə verilən reaksiyanın xüsusiyyətləri, səhvlərin müstəqil olaraq aradan qaldırılması haqqında məlumatlar daxil olur. Qeyd olunanlar bu və ya digər psixi funksiyaların formalaşma səviyyəsi, onların keyfiyyət xüsusiyyətləri, defisitlik səviyyəsi haqqında nəticə çıxarmağa imkan verir. Bundan başqa, özünənəzarət və davranışın iradi tənzimlənməsi, eləcə də emosional davamlılıq və motivasiyanın xüsusiyyətləri kimi psixi fəaliyyət komponentlərinin formalaşma səviyyəsini qiymətləndirmək olar.

Kontrol qrupa 8 yaşdan 14 yaşa qədər olan intervalda 60 nəfər sağlam, dərsdə müvəffəqiyyətli olan məktəblilər daxil edilmişdir. Hər qrupda 20 nəfər olmaqla üç yaş qrupu ayırd edilmişdi : 8 yaşdan 10 yaşadək olan kiçik məktəb yaşı dövrü; 10 yaşdan 12 yaşadək orta məktəb yaşı dövrü; 12 yaşdan 14 yaşadək böyük məktəb yaşı dövrü.

Sağlam şagirdlərin neyropsixoloji müayinəsinin təhlili aşağıdakı nəticələri əldə etməyə imkan verdi :

– Yaş artdıqca uşaqlarda qnostiko-praksis, mnemik və fikri funksiyaların inkişafında effektivlik artır.

– Psixi funksiyaların keyfiyyət təhlilinə yönəlmiş neyropsixoloji metodikaların istifadəsi həmin funksiyaların inkişafında müəyyən heteroxronluğu üzə çıxarmağa imkan verir. Bu eşitmə qnozisi ilə müqayisədə görmə qnozisinin daha yüksək səviyyəli inkişafında təzahür edir. Eşitmə-nitq yaddaşı ilə müqayisədə görmə yaddaşının daha yüksək inkişafı qeyd olunur. Xüsusən kiçik məktəbli yaşı dövründə konstruktiv praksisin yetərincə inkişafı fonunda məkani təşkilat və məkani yaddaş, nitqi tənzimləməyə əsaslanan mürəkkəb hərəki proqramların yerinə yetirilməsində çətinliklər müşahidə olunur.

Sağlam şagirdlərin tədqiqindən əldə olunan məlumatlar serebral iflicli uşaqların müayinəsinin nəticələri ilə müqayisə edilmək üçün istifadə edilmişdir.

Serebral iflicin diplegiya forması ilə 8 yaşdan 12 yaşadək olan 112 uşaq dörd əsas qrupa ayrılaraq müayinə edilmişdi.

I qrupa daxil edilən uşaqların intellektual inkişaf səviyyəsi norma diapazonunu əhatı edir. Bütün uşaqlar müstəqil və ya əsanın köməyilə hərəkət edirdilər. Onlar kütləvi məktəbin proqramı ilə təhsil alırdılar. Bu qrupun bütün uşaqlarının tibbi anamnezində vaxtından əvvəl dünyaya gəlmə və psixomotor inkişafda ləngimə qeyd olunub. Nitq tərəfindən heç bir kənaraçıxma müşahidə olunmur. Bu uşaqlar sağlam uşaqlarla müqayisədə Veksler metodikasının bütün şkalaları üzrə daha aşağı göstəricilərə malik idilər, amma hafizə və diqqət göstəricilərində əhəmiyyətli fərqlər nəzərə çarpırdı.

Səhvlərin təhlili diqqətin keçirilməsi və paylanılmasında çətinlikləri üzə çıxardı. Uşaqlarda görmə və eşitmə qnozisinə aid tapşırıqlarda çətinliklər müşahidə olunurdu. Bu çətinliklər diqqətin davamsızlığı ilə şərtlənir. Uşaqlar hərəkətlərin məkanda təşkilini, motor proqramın elementlərinin məkan xüsusiyyətlərinin yadda saxlanılmasında çətinliklərlə üzləşirdilər.

Bu qrupun uşaqlarının çoxunda sağlamlara nisbətdə iş tempinin ləngiməsi müşahidə olunurdu. Detalların məkani analizi və sintezində səhvlər aşkar olmamışdı. Eşitmə və görmə yaddaşının həcmi yaş norması daxilində idi. Səhvlərin keyfiyyət təhlili göstərdi ki, bu qrupun uşaqlarında yadda saxlanılmalı materialın elementlərinin ardıcıllığının mənimsənilməsində, həm eşitmə, həm də görmə modallığında, sözlərin təhrif olunmasında, onların inert olaraq təkrarlanmasında çətinliklər təzahür etmişdi. Beləliklə, qorunmuş intellekt fonunda serebral iflicli uşaqlar olan bu qrupda neyropsixoloji müayinə prosesində psixi proseslərin neyrodinamikasının bir sıra pozulmaları müşühidə olunurdu.

USİ-nin diplegiya formalı (25 %) II qrupunda verbal funksiyaların kifayət qədər inkişafı olsa da, intellektin strukturu disharmoniyanın ifadə olunması ilə fərqlənirdi. Keyfiyyət təhlili bu qrupa aid uşaqlarda həm iş tempinin ləngliyini, həm də məkani sintezdə çətinlikləri üzə üzə çıxardı.

Neyropsixoloji müayinə diqqətin keçirilməsi və paylanılmasında yaranan çətinlikləri üzə çıxardı. Bir sıra tapşırıqları yerinə yetirərkən uşaqlar tez-tez hərf və rəqəmləri itirir, bəzən isə yazılışına görə oxşar işarələri qeyd edirdilər. Hafizənin xüsusiyyətlərinin təhlili göstərdi ki, uşaqlar təcrid olunmuş rəqəm və sözlərlə müqayisədə məntiqi strukturları daha yaxşı yadda saxlayırdılar. Görmə modallığında yadda saxlanılan materialın həcmi, eşitmə modallığına nisbətən daha artıq idi. Keyfiyyət təhlili göstərdi ki, uşaqlar kobların üzlərini və nümunələri daha fəal müşahidə edir, fiqurlar düzəltmək üçün kubların müvafiq üzlərini seçə bilirdilər. Bununla yanaşı verilmiş nümunə üzrə məkanda detalları yerləşdirməkdə çətinlik çəkirdilər. Bu göstərici, onlarda konstruktiv nümunələrin təhlili prosesində intellektual aktların bütün strukturunun qorunduğuna, amma məkanda konstruksiya elementləri ilə əməliyyatlar aparmaq bacarığının formalaşmadığına dəlalət edir. Bir sıra tədqiqatçılar konstruktlaşdırmağın bu kimi xüsusiyyətlərini yetkin xəstələrdə sol yarımkürə qabığının əmgək-ənsə şöbələrində pozulmalarla əlaqələndirirlər. Əldə olunmuş məlumatlar serebral iflicli uşaqların tədqiq olunan bu qrupunda beynin sol yarımkürəsinin əmgək-ənsə paylarının inkişafsızlığı haqqında fikir yürütməyə imkan verir. Bir çox halda onlarda nəinki riyazi məsələlərin həllində, həmçinin demək olar ki, bütün test tapşırıqlarının yerinə yetirilməsində ləng temp müşahidə olunurdu. Psixi proseslərin neyrodinamik xüsusiyyətlərinin inkişafsızlığı ümumi ləngimə fonunda qeyd olunurdu. Bu qrupa daxil edilmiş xəstələrdə intellektin normal səviyyədə inkişafı ilə yanaşı ali psixi funksiyaların pozulması müşahidə olunurdu. Məşğələ prosesində uşaqlar özlərinə tənqidi yanaşaraq, buraxılmış səhvlərə görə narahat olur və onları özləri tərəfindən aradan qaldırılmasına görə icazə istəyirdilər. Məktəb müvəffəqiyyətinin təhlili göstərdi ki, uşaqların çoxu digər fənlərin öhdəsindən yaxşı və ya qənaətbəxş gəlsələr də, riyaziyyatın mənimsənilməsində çətinliklərlə üzləşirdilər.

Üçüncü qrupa (42,8 %) psixoorqanik sindromlarla ifadə olunan əqli gerilikli uşaqlar daxil edilmişdi. İntellekt səviyyəsi, xüsusilə qeyri verbal şkalalar üzrə orta normadan aşağı diapazonda idi. Bu qrupun uşaqlarında intellektin perseptiv təşkili ilə əlaqədar tapşırıqlar yerinə yetirilərkən aşağı göstəricilər müşahidə olunurdu.

Keyfiyyət təhlili göstərdi ki, uşaqlar təlimatı düzgün başa düşür, konstruksiyanın ümumi formasını ayırd etməyə cəhd edirdilər. Hətta təlim və köməkçi vasitələrlə belə , onlar məkanda detalları düzgün yerləşdirməyin öhdəsindən gələ bilmirdilər. Kossa testinin yerinə yetirilməsinin təhlili buraxılmış səhvlər iki əsas qrupa ayrılmışdı: uşaqlar tərəfindən nümunənin kobud sxematik quraşdırılması kimi uyğunsuzluq səhvləri; düzgün konstruksiya olunmuş formanın çevrilmiş şəkli.

Görmə qnozisinin yoxlanılması üçün tapşırıqlarında bəzi uşaqlar, əsasən də kiçik məktəbli yaşı dövründə əşyaların təsvirinin və hərflərin mürəkkəbləşmiş variantlarını tanımaqda çətinlik çəkirdilər. Bəzi uşaqlarda məktəbdə təhsilin erkən mərhələlərində hərf və rəqəmlərin yazılışında davamlı çətinliklər müşahidə olunurdu. Onlar yazdıqlarını ya çevrilmiş, ya da güzgü effekti ilə yazır, dəftərin sətrindən və damasından düzgün istifadə edə bilmirdilər. Mexaniki yaddaşın həcmi, xüsusilə də eşitmə modallığında bu uşaqlarda, əvvəlki qruplardan daha aşağı idi. Uşaqlar məzmunlu teksti daha yaxşı yadda saxlayır, əqli nəticə

ardıcıllığını düzgün tərtib edirdilər, hekayələrdə səbəb-nəticə əlaqələrini ayıra bilirdilər. Sözlü ümumiləşdirmələrin səviyyəsi digər qruplardan fərqlənmir, amma cavablar tam dəqiq deyildi [1; 40].

Ayrı-ayrı psixi funksiyaların qeyri bərabər inkişafına baxmayaraq, bu qrupun uşaqları xüsusi internat məktəblərdə və ya evdə kütləvi məktəb proqramı ilə təhsil alırdılar. Onların nəinki riyaziyyatın, eləcə də ana dili, coğrafiya və digər fənlərin mənimsənilməsində də çətinlikləri yaranırdı. Uşaqların çoxu ikinci təhsil ilinə qalırdılar.

Dördüncü qrupda xəstələrdə həm verbal, həm də qeyri verbal göstəricilər üzrə intellekt səviyyəsinin enməsi müşahidə olunurdu ki, bu da əqli geriliyin yüngül səviyyəsinə müvafiq idi. Emosional səviyyə uşaqlarda əvvəlki qruplarla müqayisədə yetərincə aşağı olmuşdur. Uşaqlar tapşırıqları yerinə yetirərkən öz fəaliyyətlərinin proqramlaşdırılmasında çətinliklərlə üzləşirdilər. Onlar nümunəni qabaqcadan təhlil etmədən (nümunədən uzaqlaşaraq) konstruktiv məsələlərin həllinə başlayırdılar. Detallarla xaotik manipulyasiya qeydə alınırdı. Öyrədici məşğələlər prosesində eşitmə nitq yaddaşı tədqiq olunarkən müəyyən olunmuşdur ki, yadda saxlanılan materialın hafizədə qorunması ilə nəzərəçarpacaq çətinliklər mövcuddur. Materialı təkrarlayarkən uşaqlar tekstdə olmayan sözləri və rəqəmləri əlavə edirdilər. Analoji səhvlər görmə modallığında da materialı yadda saxlayarkən müşahidə olunurdu. Diqqətin keçirilməsi və paylanılmasında çətinliklər bir sıra uşaqlarda impulsivlik, narahatlıq kimi davranış xüsusiyyətləri ilə birləşirdi. Bir-birinin daxilində yerləşmiş və ya təsvir edilmiş konflikt tərkibli fiqur və təsvirlərin qavranılmasında (Poppelreyter testi) bəzi müayinə olunanlar əşyaların düzgün tanınmasında çətinlik çəkirdilər. Eləcə də, zehni işdə də nəzərə çarpacaq pozulmalar üzə çıxarılıb. Bəzi uşaqlarda öz davranışına qarşı tənqidi yanaşma səviyyəsi aşağıdır. Bütün uşaqlar xüsusi korreksiya proqramları üzrə xüsusi müəssisələrdə, internatlarda və ya evdə təhsil alırdılar [2; 37-83].

USİ-nin diplegiya formasının tədqiqində psixometrik və neyropsixoloji metodların istifadəsi göstərdi ki, intellektin ümumi göstəricisinin enməsi konkret beyin disfunksiyası ilə şərtlənir. USİ-nin həmin kliniki qrupunun xarakterik xüsusiyyətləri ayırd edilmişdir:

– qeyri bərabər intellektual inkişaf: intellektin normal inkişafından əqli gerilik səviyyəsinədək ;

– ali psixi funksiyaların pozulmasının müxtəlif dərəcəli lokalizasiyası ilə şərtlənənə psixi inkişaf ləngiməsi;

– zəif ifadə olunmuş intellektual çatışmazlıq zamanı parsiallıq, ayrı-ayrı psixi funksiyaların (diqqət, hafizə, görmə-məkani qnozis və praksisin təşkili) qeyri bərabər inkişafı;

– daha aydın ifadə olunan intellektual inkişafsızlıqda isə bu təzahürlər total xarakter daşıyır və ümumi psixi inkişafsızlıqda vacib yer tutur;

– intellektual çatışmazlığın bütün səviyyələrində məkani analiz və sintezin pozulması qeyd olunur.

Məkani analiz və sintezin pozulması serebral iflicin bu forması üçün spesifik hesab olunur və beynin əmgək-ənsə strukturlarının inkişafsızlığına işarədir. Lakin serebral iflicin diplegiya formasında görmə-məkani sintezin pozulmalarının neyropsixoloji strukturu eyni cür təzahür etmir: görmə-məkani funksiyaların müxtəlif tipli fərdi qüsurlarından onların total pozulmalarınadək [3; 53].

I və II qrupa aid edilmiş uşaqlarda konstruksiya prosesində intellektual aktın strukturunun qorunması müşahidə edilirdi, amma məkanda konstruksiya elementləri ilə əməliyyatlarda çətinliklər üzə çıxmışdı. Neyropsixoloji təhlil görmə qavrayışının fraqmentarlığını təsdiq etmədi. Amma görmə qavrayışının görmə-konstruktiv fəaliyyətdən üstünlüyü müşahidə olunurdu. Yəni görmə informasiyasının sinxron qavranılması sadə tapşırıqların yerinə yetirilməsində qorunmuş olur, amma mürəkkəb konstruktiv proqramın qurulması və reallaşması lazım gələrsə, pozulmur.

III və xüsusilə də IV qruplarda məkani sintezin kobud səhvləri görmə qnozisinin və tapşırıqda ilkin istiqamətin çətinlikləri ilə birləşirdi. Bu da görmə-məkani sintezin total inkişafsızlığından irəli gəlir. Nəticədə hərəkətlərin məkanda təşkilini, konstruksiyalaşdırmanı və şəkil çəkməni, eləcə də uşaqlarda hesab əməliyyatlarının formalaşmasını çətinləşdirir.

Plastik diplegiya formasında olan serebral iflicli uşaqların neyropsixoloji müayinəsi göstərir ki, onlarda qabıq funksiyaları müxtəlifliyi ilə seçilir. Bu, uşaqlarda neyropsixoloji simptomatikanın qeyri spesifikliyi və onun diaqnostikasının qeyri müəyyənliyindən xəbər verir.

## Ədəbiyyat

1. «Детский церебральный паралич: диагностика и коррекция когнитивных нарушений» Учебно-методическое пособие, РНИМ Университет им. Н.И.Пирогова, Москва 2012

2. Козявкин В.И., Шестопалова Л.Ф., Подкорытов В.С. «Детские церебральные параличи» Медико-психологические проблемы, Львов 1999

3. Никитина М.Н. « Детский церебральный паралич» , Москва «Медицина» 1979

6. Кашкуревич Л.Г. Интерференция и положительный перенос на уровне словосочетания. М., 1974
7. Костомаров В.Г. Вопросы культуры речи в подготовке преподавателей-русистов. М., 1979
8. Щерба Л.В. Избранные работы по языкознанию и фонетике. Л., 1958
9. Верещагин Е.М. Вопросы теории речи и методика преподавания иностранных языков. М.,1969

**Süni bilinqvizm probleminə aktiv fəaliyyət yanaşması**

**Xülasə**

Bu yazıda süni ikidilliyin formalaşması probleminə yanaşma müzakirə olunur. İkidilli, elmlırin və aşağıdakı dil ünsiyyətindən əvvəl,ictimai inkişafın yaratdıqı ən vacib problemidir. Məqalədə süni bilingufflizmin formalaşması metodların inkişafına diqqət yetirilmişdir.

**Active approach to the problem of artificial bilingualism**

**Summary**

This article discusses the approach to the problem of formation of artificial bilingualism. Bilingualism is the most important problem posed by social development before the sciences and the following language communication in this article, the object of research is the development of methods for the formation of artificial bilingualism.

**Рецензент: доц. Н.Ч.Мусабекова**

**Məqalə tarixçəsi**
Göndərilib: 15 yanvar 2020 Qəbul edilib: 19 yanvar 2020

## SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУССТВОВЕДЕНИЕ

DOI: 10.36719/AEM/2007-2020/50/90-94
**Sevinc Vaqif qızı Əskərova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
pinko88@mail.ru

# KOQNİTİV TƏDQİQATLAR SAHƏSİNDƏ İNCƏSƏNƏTİN EPİSTEMOLOGİYASI

***Açar sözlər:*** *incəsənətin epistemologiyası, koqnitiv tədqiqatlar, sokonstruktivizm, transsendentalizm*
***Key words:*** *epistemology of art, cognitive research, co-constructivism, transcendentalism*
***Ключевые слова:*** *эпистемология искусства, когнитивные исследования, со-конструктивизм, транс-циенденталисм*

Məlumdurki, biliklər sistemi kimi elm inkişaf etdikcə onu öyrənən xüsusi nəzəriyyə sahəsi də yaranır. Bu epistemologiya (epistemos yunanca bilik deməkdir) adlanır. O, ümumi idrak nəzəriyyəsinin (qnoseologiyanın) ayrılmaz tərəfini təşkil edir (2,247).

İdrak nəzəriyyəsi (qnoseologiya və ya epistemologiya) nəzəri fəlsəfənin elə hissəsidir ki, burada idrakın təbiəti, onun imkanları və hüdudları, biliyin reallığa münasibəti, idrakın subyekt və obyekti kimi problemlər öyrənilir; idrak prosesinin ümumi ilkin şərtləri, biliyin doğruluq şərtləri; həqiqətin krite- risi (meyarı), idrakın forma və səviyyələri və bir sıra başqa problemlər tədqiq edilir. Başqa sözlə idrak - biliyin qazanılması və inkişaf etdirilməsi, onun daim dərinləşdirilməsi, genişləndirilməsi və təkmilləşdirilməsi prosesidir.

Bir çox elm sahələri də idrak problemləri ilə məşğuldur. Məsələn, R.Volfun yazdığı kimi: "psixologiya da idrakı öyrənir, lakin epistemologiya idrakın daxili mexanizmi ilə az maraqlanır, bizim necə fikirləşməyimizi, nə bilməyimizi müəyyən etməyin, sübut etməyin və ya təsdiq etməyin mümkünlüyü ilə məşğul olur" (1,271).

Elmi izah və nəticələrə keçməzdən öncə bir neçə məqamların açıqlanmasına ehtiyac duyulur. Beləki hazırkı məqalənin məqsədi koqnitiv elmin mühüm konseptual-metodoloji komponenti kimi, incəsənətin epistemologiyasının əhəmiyyətini dərk etmək cəhdidir. Bunun üçün aşağıda göstərilən vəzifələri həll etmək lazımdır: xarici və ölkə alimlərinin əsərlərində göstərilən sahənin tədqiq edilməsinin müasir vəziyyətinin spesifikasını müəyyən etmək; incəsənətin epsitemologiyası sahəsinin əsas istiqamətlərini və koqnitiv tədqiqatlar korpusuna qoşulması perspektivlərini işarələmək, eləcə də epistemologiyanın koqnivistika trendləri ilə determinləşdirilən fundamental problemlərinin həllində bədii-koqnitiv təcrübə sahəsinin evristik potensialını konstruksiyalaşdırmaq.

Məqalənin aktuallığı onun epistemologiyanın mərkəzi problemlərindən biri, bütövlükdə müasir mədəniyyət üçün əhəmiyyət kəsb edən mədəniyyətin rasional-diskursiv, bədii-koqnitiv və bioloji sahələrinin birliyini və sıx qarşılıqlı əlaqəsini iddia edən transdissiplinar mədəni-konvergent prosesi fenomeni aspektində biliklərin genezisi və assimilyasiyasının əldə edilməsi probleminin həllinə istiqamətlənmiş olması ilə şərtləndirilir (11). Bədii yaradıcılığın koqnitiv əsaslarının təhlili, "sosium-mədəniyyət-beyin" sisteminin tədqiqi zamanı biomədəni sosial-konstruktivizm mövqeyindən metodik və metodoloji alətlərin tətbiq edilməsinin mümkünlüyü baxımından perspektivinin vurğulanması, mədəniyyətin inkişafının hər bir mərhələsi üçün maksimal dərəcədə dolğun olan insanın təfəkkür fəaliyyətinin şəklinin qurulması, xüsusi ilə alimlərin elmi konsepsiyaların məzmununa, elmi fənnlərin formalaşması və inkişafı xarakterinə əhəmiyyətli təsir göstərən elmdənkənar amillərlə hesablaşmalı olduqları düyün nöqtələrində biliyin obyektiv sərhədlərinin müəyyən edilməsi problemin həlli üçün olduqca məhsuldardır (4,78-89).

Yaradıcılıq məntiqinin və kreativ təfəkkürün inkişafı və məşq etdirilməsi üsullarının tədqiq edilməsi-süni intellektin yaradılması, bio və tibbi texnologiyaların inkişafı üzrə tədqiqatlar yolunda müasir, qanunauyğun və zəruri bir addımdır. Göstərilən istiqamətdə aparılan tədqiqatlar belə deməyə imkan verir ki, bədii-koqnitiv fəaliyyətin refleksiv komponenti özünün nüvəsi qismində sosial və humanitar elmlərin xolistikl metodologiyasından istifadə edir ki, bu incəsənətə nəzəri mübadilə proseslərinin katalizatoru yəni, onun tətbiq edilməsinin adekvatlığı aspektində elmi biliklərin mədəni vasitəçisi rolunu oynamağa, incəsənəti təkcə elmlə transdissiplinar qarşılıqlı əlaqəyə qadir deyil, həm də insan mədəniyyətinin balanslığını, texnoloji və mənəvi təkamülünün korrelyasiyasını həyata keçirməyə xidmət edən mürəkkəb sosial-mədəni və ontogenetik şərtləndirilən konstruksiya kimi "həyatqoruma" amili funksiyasını yerinə yetirməyə qadir tamamilə unikal refleksiv mədəniyyət komponenti kimi işarələməyə imkan verir.

Təqdim edilən işin yeniliyi bədii fəaliyyətin neyrofizioloji, sosio-mədəni və fəaliyyət amilləri ilə onların elmin və epistemologiyanın fəlsəfəsinin bazis təsəvvürlərinə əhəmiyyətli təsiri aspektindən determinləşdirilmiş koqnitiv refleksiv əsaslarının aktuallaşdırılmasıdır ki, bu da öz mahiyyətinə görə yenidir. Sənətşünaslığın ümumelmi biliklər korpusu sırasında ənənvi olaraq yanlışlıqla möhkəmlənmiş təcridliyi, epistemologiya və incəsənətin fəlsəfəsinin elm və bio-art, texnoloji incəsənət kimi mədəniyyət fenomenləri çərçivəsində yaradıcılıq prosesi subyektlərinin özlərinin koqnitiv fəaliyyət üçün koordinatlar sistemini verdikləri konseptual reallıqlara yadlığı Kun variantlı paradiqmada-klassik və qeyri-klassik (sənəşünaslıq terminologiyasında – "klassik-romantik") bədii-nəzəri sistemə apellyasiyanı davam etdirməklə özünün iflasını nümayiş etdirir. Məqalə göstərilən problemin həllinə gücü çatan töhfəni verməyə xidmət edir.

Koqnitiv elm transdissiplinar tədqiqatların intensiv inkişaf edən sahələrindən birinə çevrilmişdir. Son onilliklər ərzində koqnitiv tədqiqatlarda magistral xətt rolunu mütamadi olaraq sosial və mədəni neyroelm oynayır (3,91-107). Bu nöqteyi nəzərdən mədəniyyətin neyrodeterminəşməsi, insan təkamülünün təbii və sosial traektoriyalarının qarşılıqlı şərtləndirilməsi fenomeni "sosium-beyin-mədəniyyət" sisteminin bütövlüyünün tədqiqatı çərçivəsində fəal müzakirə edilir və nəinki beyinin formalaşması və fəaliyyəti haqqında qəbul edilən əvvəlki təsəvvürlərə əhəmiyyətli dərəcədə yenidən baxmağa məcbur edir, həm də neyrobioloji strukturlar və bu və ya digər mədəniyyətin, o cümlədən bədii koqnitiv fəaliyyətin daşıyıcısı olan sosium arasında qarşılıqlı fəaliyyətin mexanizmləri haqqında qeyri-adi suallar qoyur (9, 193-201).

Hələ XX əsrin əvvəllərində alman psixoloq və dünyada ilk eksperimental psixologiya labarotoriyasının yaradıcısı Vilhelm Vundt sosial-mədəni kontekstin insanın psixiki funksiyalarına təsirinin və onların əks təsirinin tədqiqini aparmışdır. "Xalqların psixologiyası" adlı elmi işində o, vurğulayırdı ki, mental təzahürlər müəyyən sosial qrupların fəaliyyətinin nəticəsidir (12, 324-327).

Etnik mədəniyyətin subyektin psixikası strukturunda kök atması ideyası sonradan ardıcıl olaraq rus psixoloqları L.Q.Vıqotski və A.R.Luriya tərəfindən inkişaf eydirilmişdir ki, elə onlar da müasir psixologiyada sosio-mədəni istiqamətin təməlini qoyanlardırİnsanın sosial-mədəni formalaşması və bu və ya digər sosial-mədəni toplum nümayəndələrini xarakterizə edən müəyyən davranış növləri arasında qarşılıqlı əlaqəni əsaslandırmaqla onlar belə bir fərziyyə irəli sürdülər ki, insanın mədəni və bioloji həyat xəttləri prenatal inkişafın lap əvvəlindən başlayaraq biri biri ilə sıx əlaqəlidir (13, 66-77).

İncəsənətin koqnitiv parametrlərinin tədqiq edilməsi idrak fəlsəfəsində müasir transdissiplinar tendensiya ilə həmahəngdir ki, bu özünü təkcə ənənəvi təlimlərə və problemlərə qeyri-adi yanaşmalarda deyil, həm də incəsənətin epistemoloji sxemləri və geniş çəvrədən olan elmi fənnlərin sintezi kontekstində yeni koqnitiv-metodoloji prinsiplərin hazırlanmasında təzahür edir ki, onların da bir çox olduqca məhsudardır. İncəsənət fenomeninin məhz epistemoloji göstərişlərinin dərk edilməsinə istiqamətlənmə L.Q.Berqer, B.Varqa, P.P.Qaydenko, B.M.Qaleyeva, O.N.Danilova, İ.A.Yevin, C.Kaloti, A.A.Koblyakov, A.N.Kruqlov, Y.L.Feynberq, D.R.Hofştadter, N.Şvindt-Qross və başqalarının tədqiqatlarında kifayət qədər hissedilən tendensiyadır. Vurğulamaq lazımdır ki, onlarda israrlı tendensiyanı eyni zamanda subyektin kreativ fəaliyyətinin diskursiv və intuitiv elementləri, təbiət elmləri və bədii mədəniyyətin bütün zənginliyi təcrübəsinin vahid məntiqi zənciri ilə əlaqələndirirlər ki, bu dil-musiqi-riyaziyyat, riyaziyyat-təsviri incəsənət-musiqi, bədii layihələndirmə-informasiya-kommunikasiya texnologiyaları və s. kimi qarşılıqlı əlaqələrin əsaslandırılması ilə illüstrasiya olunur. Lakin göstərilən təzahürlərin neyroelmi determinantlarının müəyyən edilməsi ölkə alimlərinin problemi sahəsinə daxil deyil (6).

XXI əsrin əvvəli neyroelmin bölməsi-neyroestetikanın formalaşması ilə əlamətdardır ki, onun predmeti incəsənət əsərlərinin yaranması və təhlilinin neyroloji prinsipləridir. Hələ ki, yaranış mərhələsini yaşayan bu istiqamətin nümayəndələrinə görə koqnitiv-bədii yaradıcılığın təbiəti və tarixi üzvü şəkildə tarixi və bioloji determinasiyalı mədəniyyət kontekstinə daxil edilmişdir. Koqnitiv-bədii fəaliyyət gedişində enaktivist başa düşülən subyekt müəyyən növdən olan inteqrasiyalı koqnitiv-bədii patternlər şəklində obrazlar əks etdirir ki, bu da göstərilən fənn sahəsinin predmetidir. Burada hind psixoloqu V.Ramçandran işlərini qeyd etmək lazımdır. İncəsənətin epsitemologiya sahəsinin koqnitiv tədqiqatlar korpusuna daxil olmasının əsas istiqamət və perspektivlərini konkretləşdirərək qeyd etmək lazımdır ki, göstərilən sahənin daha perspektivli istiqaməti kimi sosial və mədəni neyroelm sahəsindəki ən yeni nailiyyətləri incəsənətin ontoloji məkanı proyeksiyasında biomədəni sokonstruktivizm mövqeyindən dərk etmək, strukturlaşdırmaq və ümumiləşdirmək səyləri görünür. Fənnlərarası və transdissiplinar tendensiyaların güclənməsi, onların post qeyri-klassika əsasları ilə korrelyasiyalı qarşılıqlı əlaqəsi incəsənətin koqnitivləşməsinə gətirib çıxardı ki, bu da estetik funksiyanın tədqiqat funksiyasına transformasiyasında ifadə əldə etdi, eləcə sənətşünaslığın epistemoloji tərkibinin xüsusi aktuallığını qazandı. XX-XXI əsrlərin qovşağında bütöv diskursiv təcrübələr şəbəkəsinin bədii strategiyaları-"biomedia", "nanomedia", "hybridmedia"-artıq bədii yaradıcılığın klassik metodologiyasına uyğun olaraq interpretasiya və reprezentativ prinsiplərin realizə edilməsinə deyil,

konstruktivliyin yeni anlayışının axtarışına, texnologiyanın bütövlükdə yeni anlayışına və onun mədəniyyətdə antipod kimi deyil, təbiətin sonsuz davam etməsindəki roluna istiqamətlənmişdir, insan isə burada-onun təkamülü prosesində yalnızca bir mərhələdir. Daha sonra Science və Bioart kimi transdissiplinar mədəniyyət fenomenlərinin ortaya çıxması ilə incəsənət müasir mədəniyyətin bütün intellektual məkanı üzərində kritik və nəzəri refleks spektrinə, incəsənətin epistemologiyası isə-onun müxtəlif cinsli koqnitiv təcrübələri və mənəvi fəallığı sintes etməyə imkan verən və konseptual karkasın hazırlanması və informasiya-bilik axınlarının ümummədəni inteqrasiyalı patternlərlə birləşməsinin baş verdiyi problemli düyün nöqtələrdə koqnitiv təcrübələrin bütün korpusunu təşkil edən özünüeyniləşdirmənin həyata keçirilməsi üçün elmin müasir epsitemoloji fəlsəfəsi üçün zəruri olan effektiv metodoloji alətləri təklif edən koqnitoloji forpostuna çevrilir. Enaktivizmin paradiqma karkasına “aşağıdan” müdaxilə etməklə incəsənət təbiət elmləri, bioloji təkamül nəzəriyyəsi, neyrofiziologiya, psixomotor hərəkət nəzəriyyəsi, epsitemologiya, texnika və kompüter texnologiyaları arasında boşluğu doldurmağı bacardı, incəsənətşünaslıq isə koqnitiv, xüsusən də neyroelmi tədqiqatlar tandeminə dayanıqlı şəkildə daxil oldu. Ənənəvi subyekt-obyekt mexanizmlərindən fərqli, inteqrasiyalı koqnitiv patternlərin meydana gəlməsi koqnitiv-bədii fəaliyyətin əsas və mexanizmlərinə yenidən baxılmasını, eləcə də həmin vəzifələrə adekvat olan təfəkkür üslubunun metodoloji karkasının hazırlanmasını tələb edir (6).

Neyroelmin ən yeni nailiyyətləri göstərir ki, öz məzmununa görə sosio-mədəni amillər beyində baş verən obyektiv biokimyəvi proseslərə və genetik məzmunun və beynin fəallığının dəyişməsinə əhəmiyyətli və hətta həlledici təsir göstərir, sonuncular isə öz növbəsində dərketmə, diskurs və insanın bütövlükdə idrak fəaliyyətinin xüsusiyyətlərinin müəyyən xarakteri ilə xarakterizə edilən müəyyən sosial-mədəni mühitlərin formalaşması və dəstəklənməsinə xidmət edə bilər. Bu idrak subyektinin biomədəni so-konstruktivizm mövqeyindən təhlilini ehtiva edir, bu da bütövlükdə subyektin koqnitiv fəaliyyəti fenomeni, incəsənətin özünün fenomeninə (diskursiv və intuitiv-biolojiyə münasibətdə təbii şəkildə bədii-koqnitiv reallıq genezisini determinləşdirən “üçüncü” komponentin mövcudluğunu nəzərdə tutur münasibətdə klassik epistemologiyanın ənənəvi loqosentrik göstərişlərinə, eləcə də incəsənətin deantropologiyası perspektivlərinə faktiki olaraq yenidən baxılması zərurətini bildirir. Tədqiqatın göstərilən vektoru “çevik” rasionallığın onun “lokal” və “universal” səviyyələrinin insanın bütöv mənəvi fəallığı məkanında “sosium-mədəniyyət-beyin” bütöv sistemi strukturunda konkret sosiumun və mədəniyyətin vəziyyətində ontogenetik şərtləndirilməsi və realizə edilməsinin qarşıqlılı şərtləndirilməsini nəzərə almaqla epistemoloji əsaslarının axtarışı ilə birbaşa qarşılıqlı şəkildə əlaqəlidir (7, 29-32).

Belə bir faktı diqqətə alaraq ki, elmin fəlsəfəsi və epsitemologiya koqnitiv tədqiqatların konseptual istiqamətini, problematikanın fundamentallığını və metodoloji sabitliyini təmin edirlər, bu başlanğıcdan koqnitiv elmlərin problemlər sahəsini, məhz intellekt və biliklərin təbiəti haqqında, təfəkkür prosesləri və və beyinin ontogenetik əsaslarının nisbəti haqqında, sosio-mədəni və bioloji olaraq determinləşdirilmiş əqli fəaliyyətin simvolik təbiəti və s. haqqında məsələləri konstruksiyalandırmış, burada müasir mədəniyyətin idraki mənəvi təcrübələrinin bütün məcmusunun inkişaf vektorunu verən koqnitivistikanın bu forpostu üçün evristik perspektivləri işarələmək lazımdır (8, 76-86).

Epistemologiya üçün bədii-koqnitiv fəaliyyətin neyroelmi əsasları idrak subyektinin ənənəvi transsedentalizm və koqnitiv universallıq təsəvvürlərinin təkrar dərk edilməsi və transformasiya zərurətinin qavranmasına əlavə impuls verir. Məhz-sosial-mədəni və bioloji determinantlar və idrak təcrübəsi arasında konkret korrelyasiyaların qurulması hesabına idrak mexanizmlərinin fəaliyyət komponentlərinə böyük əhəmiyyət verilir. İdrakda mütləq və relyativləri, tədqiqatın xolistik və analitik metodları arasında nisbətin yeni tərəflərinin aşkar edilməsi aspektində elmi və bədii koqnitiv təcrübələrin qarşılıqlı determinasiyasının qurulması bütövlükdə idrak proseslərini tənzimləyən təməl definisiyaların bərpası üçün yaxşı impuls olacaqdır. İncəsənət və bədii idrak fəaliyyətinin beyinin psixofizioloji və neyrofizioloji təzhürləri kimi dərk edilməsinin və biliklərin bədii-koqnitiv konseptlər formasında nəqlinin xüsusiyyətlərinin nəzərdən keçirilməsi idrak fəaliyyətində aprior və aposterior nisbət haqqında təsəvvürlərin korrelyasiyasına imkan verəcək, eləcə də tədqiqatın kantian proqramının formalaşmaqda olan neyroestetika sahəsi ilə uyğunluğunun konkret tərəfləri və perspektivlərini aşkar edəcəkdir (6).

Elmin fəlsəfəsi üçün elmdə koqnitiv proseslər haqqında təsəvvürlərə arxalanaraq bədii yaradıcılığın koqnitiv-refleksiv mexanizmlərinin neyrobioloji şərtləndirmə prizmasından keçərək estetik həyəcanlarla generasiya edilən təhlili artım nöqtələrinin ümumiliyi və birliyi ideyasını əsaslandırmağa imkan verəcək. Bu isə öz növbəsində beyinin reprezentasiya və spesifik təşkili mexanizmlərinin fəaliyyətini və subyektin bədii koqnitiv yaradıcılıq prosesində müəyyən sosio-mədəniyyət kontekstində determinləşdirilmiş idrak göstərişlərinin dəqiq korrelyasiyasını, eləcə də əks asılılığın mövcudluğunu müəyyən etmək imkanı verəcəkdir. Neyroelm məlumatları əsasında rasional diskursun ontoloji məkanı haqqında təsəvvürlərin

transformasiyası müasir incəsənətin parlaq ifadəli konseptləşməsini, riyaziləşməsini, formalizmini və intellektual yüklülüyünü izah etməyə - subitasiya (S.Dean tərəfindən kəşf edilən "rəqəm hissi") fenomeni mövqeyindən onun diskurs spesifikasını müəyyən edən incəsənət növlərinin bütün məcmusunun koqnitiv karkasının ayrılmaz struktur elementi kimi riyazi modellərin fəaliyyət göstərməsi nümunəsində bədii və riyazi yaradıcılığın aprior əsaslarının statusunun dərk edilməsi kimi məntiqi-analitik komponentlərlə yaradılır intuisiyasının determinləşməsinin, mütləq istənilən bədii-koqnitiv reallıq çərçivəsində onun bütün elementləri səviyyəsində "qızıl orta" prinsipinin təsirinin konstantlığını, əsasında insanın beyni və sinir sisteminin neyrofizioloji xüsusiyyətlərinin durduğu musiqidə stereoqnoz təzahürünü, incəsənətdə fraktalların neyrobioloji determinasiyasını, dirçəliş dövrü təsviri incəsənətində J.Dezarqın proyeksiyalı həndəsənin formalaşması xüsusiyyətlərini müəyyənləşdirməyə imkan verəcəkdir. İstər qərb, istərsə də şərq mentallığında koqnitiv-bədii yaradıcılıq subyektinin fəallığının spesifika və istiqamətinin təhlili vasitəsi ilə gen-mədəni qarşılıqlı təsirlər mexanizmlərinin dəqiq şəklinin müəyyən edilməsi insanın pisxofizioloji xüsusiyyətlərinin formalaşması və onların transgenerasiyalı irsiyyəti üçün epigenez proseslərində bədii yaradıcılığın (onun həm generasiya, həmdə qavrama mərhələlərində) mühümlüyünü dərk etməyə imkan verəcək (10,4-18).

Tədqiqatların göstərilən istiqamətlərinin dominant nəticələri təkcə bədii-koqnitiv deyil, həm də bütövlükdə mədəniyyətin idrak sahəsinin genezisini təbii şəkildə izah edən diskursiv və intuitivə aid bioloji komponentin-"üçüncünün"-mövcudluğunu nəzərdə tutmaqla incəsənət fenomeninə münasibətdə klassik epsitemologiya göstərişlərinə yenidən baxılması, yaradıcı koqnitiv qabiliyyətlərin realizə edilməsində baş beyinin neyrostrukturlarının plastiklik həddinin aşkarlanması, eləcə də bütövlükdə koqnitiv qabiliyyətlərin inkişafı və onların idarəedilməsi üçün beyinin plastikliyinin öyrənilməsinin mühümlyünün müvafiq anlaşılmasının əldə edilməsi olmalıdır.

Beləliklə, incəsənətin epsitemologiyasının koqnitiv elmin səmərəli konseptual-metodoloji komponenti kimi əhəmiyyətinin təhlili göstərir ki, müasir art-məkanın bədii-nəzəri sisteminin konseptual əsasını yanaşmalar və istiqamətlərin məcmusu təşkil edir ki, onlar özlərinin nüvəsi qismində təbiət-elmi biliklərin, texnika və texnologiyaların metodologiya və metodlarına əsaslanırlar. Bu da öz növbəsində nəinki təkcə inteqrasiya etməklə elm və incəsənət kimi biri birindən ənənəvi olaraq uzaq olan sahələr arasında çoxəsrlik "gərginliyi" aradan qaldırmağa, həm də insanın texnoloji və mənəvi təkamülünün tarazlaşdırılmasının, korrelyasiyasının həyata keçirilməsinə xidmət etməli olan mürəkkəb sosial mədəni və ontogenetik şərtləndirməli konstruksiyanın-inteqrasiyalı intellektual təhsil kimi incəsənətin genezisi və təkamülü haqqında təsəvvürləri əsaslandırmağa imkan verəcəkdir. Bu texnoloji prosesin təkamülü, bəşəriyyətin mənəvi-əxlaqi inkişafı və onun ekoloji tarazlığın əldə etməsi prosesində texniki-humanitar balansın təmin olunmasında mühüm komponent kimi incəsənətin koqnitiv və metodoloji statusunun möhkəmlənməsinə xidmət edəcəkdir. Bu prosesin nəticəsi şəxsi koqnitiv mexanizmlərinin və dəqiq və təbiət elmlərinin koqnitiv mexanizmlərinin konvergensiyasına nisbətdə incəsənətin epistemologiyasının "həlledən" parametrlərinin işarələnməsi olur ki, o idrak prosesinin bütöv şəklinin formalaşması üçün, eləcə də bir sıra innovasiyalı koqnitiv texnologiyalarla birləşmiş olan internəzəri mübadilə proseslərinin katalizatoru qismində çıxış edən metarefleksiyanın ümumelmi modelinin hazırlanması prosesində bədii-koqnitiv təcrübə sahəsinin yüksək idrak potensialını izah edir. Artıq aparılmış olan tədqiqatların məlumatları koqnitiv tədqiqatlar müstəvisində incəsənət epistemologiyasının olduqca yüksək evristik potensialını göstərir: transdissiplinarlıq prizması vasitəsi ilə bədii yaradıcılıq sahəsinin neyrokoqnitiv əsaslarının təhlili elmin müasir fəlsəfəsinin bir sıra problemli düyünlərinin həllində mütləq yeni yanaşmadır-elmin və mədəniyyətin qeyri-rasional sahələrinin təkamülü, elmin və incəsənətin koqnitiv strukturlarının idrakın ümummədəni təkamülü səviyyəsində inteqrasiyalı qarşılıqlı əlaqəsi problemi incəsnət növlərinin bütün məcmusunun onun diskursiv spesifikasını müəyyən edən koqnitiv karkasının ayrılmaz strukturlaşdırıcı elementi kimi riyazi modellərin fəaliyyəti nümunəsində yaradıcılıq intuisiyasının məntiqi-analitik təfəkkür komponentləri ilə determinləşməsini üzə çıxarır. Neyroelm ideyalarının incəsənətin epistemologiyası sahəsinə inkorporasiyası istər riyaziyyat, istərsə də incəsənət sahəsində idrak prosesinin təbiətinin neyrobioloji determinasiyası haqqında təsəvvürləri transformasiya edir və təkcə riyazi deyil, həm də subitasiya (S.Dean tərəfindən kəşf edilən "say hissi") fenomeni kimi çıxış edir. Fraktal incəsənətin neyrobioloji determinləşməsi, istənilən bədii-koqnitiv reallığın özünün elementlərinin bütün səviyyələrində tabe olduğu "qızıl orta" qanunu, əsasında insan beyni və sinir sisteminin neyrofizioloji xüsusiyyətlərinin durduğu musiqidə stereoqnoz fenomeni mövqeyindən aprior əsaslara həqiqi qiymətini verir. Bundan əlavə o, məntiqi koqnitivizmlə əlaqəli olan xəttlərin inkişafını nəzərdə tutmaqla yeni şəraitdə psixologizm proqramının dirçəldilməsinə əsaslar verir. İnsan beyinin önverilən (apriori) fərdi xüsusiyyətləri (subitasiya fenomeni, naviqasiya mexanizmləri şəklində "qabıq" sisteminin mövcudluğu) nəzərdə tutulmaqla neyroelm bazisinin nəzərə alınması ilə fəaliyyət transsendentalizmi konsepsiyasına yenidən baxılması, sosial-mədəni amillərlə determinləşdirilən

fərdüstü (aposterior) xüsusiyyətlər (misal üçün, analitik və ya sintetik təfəkkürün dominantlığı; fərdiyyətçi (qərb) və "kollektivçi" (şərq) cəmiyyətlər) ənənəvi transsendentalizmə xas olan idrak subyektinin koqnitiv universallığının məhdudluğunun dərk edilməsi üçün mühüm əhəmiyyətə malikdir və idrak subyektinin sosial-mədəni, fəaliyyət və neyrofizioloji fəallıq determinləşməsi proseslərini yenidən interpretasiya etməyə, eləcə də İ.Kantın transsendentalizm konsepsiyasına biomədəni sokonstruktivizm ideyasına müvafiq olaraq yeni ölçülər verməyə məcbur edir (5,7-21).

## Ədəbiyyat

1. Rüstəmov Y. Fəlsəfənin əsasları (mühazirə kursu) Bakı, «NURLAR» Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2007,504 səh.
2. Hacıyev Z. Fəlsəfə. *Ali məktəblər üçün dərslik.* "Turan evi" nəşriyyatı, Bakı 2012, 488
3. Бажанов В.А., Краева А.Г. Феномен трансдисциплинарной когнитивной революции // Российский гуманитарный журнал. 2016. Т. 5. № 2. С. 91-107.
4. Бажанов В.А. Социум и мозг: биокультурный со-конструктивизм // Вопросы философии. 2018. № 2. С. 78-89.
5. Бажанов В.А., Краева А.Г. Музыка в фокусе современной нейронауки // Вестник Томского государственного университета. Философия. Социология. Политология. 2017. № 40. С. 7-21.
6. Краева А.Г. Эпистемология искусства в пространстве когнитивных исследований: оснавные направления, современное состояние и преспективы. Грамота, 2018. № 11(97).
7. Киященко Л.П. Когнитивная инновация в фокусе философии трансдисциплинарности // Знание. Понимание. Умение. 2012. № 2. С. 29-32.
8. Киященко Л.П. Беспокойство становления целостностью. Вариации на тему трансдисциплинарности // Вопросы философии. 2015. № 11. С. 76-86
9. Князева Е.Н. Трансдисциплинарные стратегии исследований // Вестник Томского государственного педагогического университета. 2011. № 10. С. 193-201.
10. Фаликман М.В., Коул М. «Культурная революция» в когнитивной науке: от нейронной пластичности до генетических механизмов приобретения культурного опыта // Культурно-историческая психология. 2014. Т. 10. № 3. С. 4-18.
11. Трансдисциплинарность в философии и науке: подходы, проблемы, перспективы / под ред. В. Бажанова, Р. Шольца. М.: Навигатор, 2015. 564 с
12. Вунд В. Психология народов. М.: Эксмо, 2002. 864 с
13. Лурия А. Лекции по общей психологии. СПб.: Питер, 2006. 320 с.

## The epistemology of art in the field of cognitive research

**Summary**

The presented article analyzes the neurogenetic basis of artistic thinking, the interaction aspect of science and art. The implications of this research for the scientific philosophy are determined. At the same time, Kant's new conception of transcendentalism, in line with the idea of biocultural coconstructivism, defines the role of epistemology in the scientific philosophy and cognitive research in modern times.

## Эпистемология искусства в области когнитивных исследований

**Резюме**

Как известно, с развитием науки, появилась теория изучения научной мысли – эпистемиология. В данной статье анализируются нейрогенетические основы художественного мышления, аспект взаимодействия науки и искусства. Определяется значимость этого исследования для научной философии. В сфере искуствоведения важны такие понятия как дискурсия и интуиция.

**Rəyçi: prof. Ə.M.Tağıyev**

**Məqalə tarixçəsi**
Göndərilib: 21 yanvar 2020 Qəbul edilib: 24 yanvar 2020

## JURNALIN İÇİNDƏKİLƏR

### TARİX HISTORY ИСТОРИЯ



### DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ



### ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ



### HÜQUQ JURISPRUDENCE ЮРИСПРУДЕНЦИЯ



### SOSİOLOGİYA SOCIOLOGY СОЦИОЛОГИЯ



### PEDAQOGİKA PEDAQOGY ПЕДАГОГИКА

## TƏDRİSİN METODİKASI  THE METHODOLOGY OF TEACHING МЕТОДИКА ПРЕПОДАВАНИЯ



## SƏNƏTŞÜNASLIQ  ART CRITICISM  ИСКУССТВОВЕДЕНИЕ

